**Kitabda müəllifin ayrı-ayrı illərdə mətbuatda dərc olunmuş hekayələri, məqalələri və müsahibələri toplanmışdır.**

# ÖN SÖZ

Mən Rüstəm Dastanoğlunu cismən 30 il, ruhən dastan dövründən bu yana tanıyıram. Özü də yaxşı tanıyıram. Bu 30 il ərzində zamanın özü belə dəyişsə də, onu dəyişə bilməyib. **Rüstəm folklor dövrünün bayatı havası, Aşıq Ələsgər irfanı, Kiyev intellektual taxçası, sərt Bakı reallığı ovqatının sintezində yaratdığı öz nəsr fəzasını hələ çox gənc yaşlarından ilmə-ilmə hörür.** Onun ilk hekayəsi 80-ci illərdə artıq püxtələşmiş nəsr nümunəsi kimi dövrün məhşur ədibləri tərəfindən qəbul edilirdi. Amma əsas olan bu deyil. Əsas olan Rüstəmin Göyçədən, ancaq onun Daşkəndindən qaynaqlanan və bu günə qədər yaşadığı ədəbi və əbədi hissi duyğular, nəsrinin kökündə dayanmış ənənə silsiləsidir. Mənim üçün o bu gün yazdığı ilə maraqlı olsa da, daha çox o ənənədən qoruduğu dəyər və hikmətləriylə maraqlıdır. Hansı ənənədən gəlməsilə heyrətlidir. Ənənəni, kökü nəsrində yaşatması ilə fəxr ediləndir. **Rüstəm Dastanoğlu mətninin özəlliyi ilk növbədə dilin, təhkiyənin, sətraltı mənanın dastan ənənəsində və ruhunda yaşadılması, dastan üçfəzalılığının realist fəzada qorunmasıdır. Ən realistik mətndə belə Rüstəm yerin altını, göyün üzünü və yerin üstündəki real həyatı eyni zamanda və ovqatda birləşdirə bilir.**

Və bu dastan reallığı onun mətnini şirin edir. Bunun üçün də mənə görə o, ilk növbədə bəlkə də yazdıqlarından da qabaq milli kökə köklənmə haləsində bir etap kimi dəyərlidir. Rüstəm Dastanoğlunun yazdığı nəsri də, yazdığı zaman kəsiyi də, ənənəyə köklənmə dastanıdır. Təsadüfi deyil ki, onun özü də bu kitaba topladığı mətnlərin birində köklənmə havasına toxunur. Əslində bu dünyada yaşamağı hiss edən hər bir insan gec-tez yazıçı olmalıdır. Fikrimcə hər bir ömür Allahın tamam başqa bir şəkildə yaşamının təkrarı olduğu üçün dəyərlidir və mütləq yazılmalıdır. Əlbəttə ki, Rüstəm ilk növbədə özünü yazır. Amma bu yazı daha çox nəsr ilə bağlıdır deyə və dostum Rüstəmin nəsriylə bağlıdır deyə onun yazdığı mətnlər kontekstində də dediyimi bədii mətn zəminində açmağa çalışacam.

Bu kitabda yer almış Rüstəmin məşhur "Kölgə" hekayəsi üzərində onun ümumi yaradıcılığına nəzər yetirəcəyəm. Hekayənin qəhrəmanı anası ilə gündəlik ağır zəhmətdən sonra işdən evə dönən azyaşlı uşaqdır. Bu bədii qəhrəman əslində yazıçının altereqosudur. Bu uşaq üçün mətndə dünya hələ rənglərin, səslərin, hadisələrin bir-biriylə qarışdığı və hələ tam formalaşmadığı zamandır deyə sürətli və tələskəndir. Bununla belə tanınandır. Onun ən dayanıqlı, tanıyıb-bildiyi və sevdiyi məkan hələ ki, bu dünyada, əlbəttə ki, gözünü açıb-gördüyü, zəhmətini belə onunla bölüşdüyü anasıdır. Anası mətndə onun əlindən tutub bütün günü iş-

lədiyi ağır işini belə unudaraq evə – yuvasına dönür. Uşaq üçün hələ ki bundan əziz heç nə yoxdur. Ana və yuva hələ ki onun tanıdığı ilkin sevgi obyektləridir. Və birdən-birə anası ona tanımadığı, bilmədiyi və hələ yaşamadığı qorxunc xatirələr və düşüncələr dünyasını tanıdır. Anası burda, uşağın yanında olsa da, sən demə həm də düşüncələrindəymiş. Uşaq hələ belə bir halın olduğunu bilmir və bu halı ilk dəfə yaşayır. Mətndə anası qəfil ona taleyi gətirməmiş öz bacısını tapşırır. Hələ təzə pöhrələnən, həyatı tanımayan uşağa özünün belə çəkə bilmədiyi ağır yükü bir borc kimi həvalə edir. Və uşaq qəfil bu tapşırıqdan anlayır ki, gözüylə gördüyü və özü üçün pillə-pillə tanıdığı hadisələrdən və işlərdən savayı bu hələ onun üçün yaşanılacaq dünyada ağır iş günündən sonra anasına bütün ağrılarını unutduran bir sevgi, bir borc, bir vəzifə kimi ruhsal dəyərlər də varmış. Və bu sevgi bacının bacıya olan sevgisi və ananın oğula olan ərkidir. Bax bu ərk məsələsiylə Rüstəm Dastanoğlu, məsələn, Qərb nəsrində olmayan bir milli dastan elementiylə mənim üçün tamam fərqli bir nasirdir.

Rüstəm Dastanoğlunun bu kitabı onun yaşadığı müəyyən bir yaş dövrünün təcrübəsidir. Bu təcrübə vicdanla, alnıaçıq yaşamış zehniyyatın bədii şəkillənməsidir. Bu təcrübəni öyrənməyə və onun haqqında düşünməyə dəyər.

**Orxan Fikrətoğlu**

# MÜƏLLİFDƏN

80-ci illərin axırlarından bəri mənim hekayələrim, analitik-fəlsəfi, analitik-publisistik, səfər qeydlərim və digər yazılarım jurnallarda, qəzetlərdə, ayrı-ayrı saytlarda çap olunub. Başqa dillərə tərcümə edilib.

Bir dəfə Azərbaycanımızın, eləcə də müasir Dünyanın böyük şairi Ramiz Rövşən mənə dedi ki, yazılan yazılar da insanlar kimidi; əgər yazılar jurnallarda, qəzetlərdə çap olunub qalırlarsa, kirayədə yaşayan insan kimi, onlar da elə bil kirayələrdə yaşayırlar, daimi ünvanı olan mənzilləri olmur. Elə ki, onları toplayıb kitab halına salırsan, çap elətdirirsən, deməli, onların da mənzilləri olur...

...Mən də o qərara gəldim ki, müxtəlif zamanlarda, ayrı-ayrı mətbu orqanlarda çap olunan, dağınıq halda yaşayan yazılarımın bir hissəsini bir dam altına – bir kitabın içində toplayım.

...Hər halda, yazıların yeni mənzilləri mübarək olsun deyirəm!

...Və çox təəssüf ki, yazdıqların heç vaxt, tam düşündüklərin olmur, olsa-olsa, düşüncələrinin qırıq-qırıq kölgələri ola bilir. Bu kitaba da mənim düşüncələrimdən kiçik kölgələr hopub. “Düşüncələrimin kölgəsi” kitabını böyük sevgi ilə Sizlərə təqdim edirəm.

# TƏNHALIQ HƏSRƏTİ

*Üç qardaşın: dədəm Dastanın, əmilərim Abdulla və Qəhrəmanın əziz xatirəsinə*

...Bu bina lap Nuh əyyamından qalma idi. Allah bilir, suvağı tökülmüş, bomboz bozarmış daşlardan qalın divarları olan bina nə vaxt, niyə, kim tərəfindən tikilmişdi? Və bu binanın qalın divarlarını vaxtilə kimlərin nəfəsi isitmişdi?

Bütün bunlardan onun xəbəri yox idi və bu haqda heç vaxt fikirləşməmişdi. Fikirləşmək üçün, bir şeyi çözələmək üçün asudə beyin, bütöv iç, bir də asudə beyinlə bütöv için arasında əlaqə lazım idi. O da onun qismətinə düşməmişdi, düşmüşdüsə də, ömür yolunda o asudəliyə, bütövlüyə, onların arasındakı əlaqə xəttinə qurd düşmüşdü və qurd Allah-Təalanın beyinə qoyduğu asudəliyi, içdə qurduğu bütövlüyu, onların arasında calaşdırdığı xətti dağıdıb yox eləmişdi.

...Sonralar Nuh əyyamından qalma bu binanın içində hərbi hazırlıq dərsi keçmək üçün, arakəsmələrlə balaca-balaca, kameralara oxşar siniflər düzəltmişdilər. Və bu kameralara oxşar bapbalaca siniflərin hərəsinin

payına bir bapbalaca ayna düşmüşdü. Aynaların sahəsini də şüşədən çox ikiqat çərçivənin saysız-hesabsız ağacları tuturdu. Siniflər qaranlıq olduğundan bütün günü işıq yanırdı. Bu balaca siniflərə iyirmi beş-otuz oğlan doluşurdu. Sinfin havası ağır və bürkülü olurdu. Mühazirə oxuyan zabitin dediklərindən bir-iki cümlə yazmamış yuxu, əlində siyirməqılınc başının üstünü kəsdirirdi. Lap belə ömrün boyu yataydın və səni təzəcə yuxudan oyadıb, gətirib həmin sinifdə oturdaydılar, xeyri yox idi: yuxu ağır daş kimi kirpiklərindən açılıb, gözlərini yumurdu. Bir də, nə gizlədəydi, hərbi dərs onun üçün tamam maraqsız idi. Zabitlərin oxuduqları mühazirələrə qulaq asa bilmirdi. Bu elə bapbalaca vaxtından, deyəsən onun qanına hopmuşdu. Nədənsə, uşaq çağlarında da, yaşıdlarına qoşulub heç vaxt "tüfəng-tüfəng" oynamazdı. Hava bürkülü, ağır ola, danışılan söhbət də sənin üçün tamam maraqsız, həm də tərpənmədən bir yerdə oturasan. Belə bir vəziyyətdə dəmir iradə lazım idi ki, yaxanı yuxunun əlindən qurtara biləsən. O iradə də ki, neyniyəydi, onda yox idi. Çəkilirdi arxa partaya, dirsəklənib alnını alırdı əlinin içinə, başını dəftərin üstünə əyirdi, o biri əlində də qələm, guya mühazirəni yazırdı. Zabit mühazirəni yazmamağından duyuq düşəndə Vadim (dostuydular, həmişə bir yerdə otururdular) yavaşca ona toxunurdu, o da əlini alnından götürmədən ayılıb ağ vərəqi o biri üzünə çevirirdi, guya bu səhifəni indicə doldurdu, indi

də təzə səhifəyə keçdi. Başlayırdı bir-iki sətir zabitin dediklərindən qaralamağa.

Yoldaş podpolkovnik yenə mühazirə oxuyurdu; lövhədə formullar yazırdı, pozurdu, divardan asılmış sxemlərdə əlindəki çubuqla nə isə göstərirdi. O isə nə zabitin dediklərini eşidirdi, nə də onun yazdıqlarını, göstərdiklərini görürdü. Fikri-zikri hardasa bütünlüklə dünən axşam baxdığı "Amadey" filminin yanında idi. Film onu tutub başqa dünyaya aparmışdı. Nədənsə, insanın ayıq başla bu cür şeylər yaratmasına inana bilmirdi. Beyni bərk məşğul olduğundan yuxu "yazıq" da hürküb ondan uzaqlarda fırlanırdı, ona yaxın düşə bilmirdi. Qələmi də yalandan dəftərin üstündə o tərəf bu tərəfə gəzdirirdi ki, mühazirəni yazmamağından yoldaş podpolkovnik duyuq düşməsin. Yavaş-yavaş anlayırdı ki, filmdə bəzi şeyləri başa düşməyib. Filmə bir də baxmaq könlündən keçdi. Sol tərəfə əyildi, Vadimdən soruşmaq istədi ki, "Amadey" filmi daha hansı kinoteatrda gedir? Yoldaş podpolkovnik əyildiyini gördü. Heç nə demədən tərs-tərs ona baxdı və o, fikrindən daşındı, yalandan əyilib partanın altına baxdı, guya Vadimə söz demək üçün yox, partanın altına baxmaq üçün əyildi.

Bıy?! Xeyir ola, bu kimindi: Vadimin? Yox! Ola bilmiz? Vadimin tökülüb itən, dovşan dərisindən olan papağını tezdən bir yerdə asılqana vermişdilər.

Qabaqda, böyürlərində oturanları gözaltı nəzərdən keçirdi, heç birinin ola bilməzdi, bir də onların olsaydı, papaqları öz partalarının altında olardı.

Onlardan əvvəl bu sinifdə dərs keçən vzvodun uşaqlarından kiminsə, yəqin yadından çıxıb qalmışdı. Papağı yavaşca partanın dərinliyinə itələdi ki, görən olmasın.

Bunların qiyməti neçəyə olur? – Bu saat kim satırdı bu papaqdan?.. Hə, yadına düşdü. Saşa, qırmızı diplomlu alverçi Saşa.

Saşa doğrudan da, onların institutunu qırmızı diplomla bitirmişdi, Elmi Tədqiqat İnstitutunda elmi işçi işləyirdi. Əlbəttə, onun alver üzrə qırmızı yox, heç göy diplomu da yox idi, amma kişi alverin sirlərini elmin sirlərindən heç də pis bilmirdi. Niyə də bilməyəydi? Elmlə məşğul olmasına ayda 110 manat verirdilərsə, alverlə o pulu iki-üç günə çıxardırdı. Gərək ki, həmin Saşa bu papaqlardan birini 250-dən.

– Student Aslanov!

– Ya! – deyə tez yerindən sıçrayıb “farağat” vəziyyətində durdu.

– Pocemu leksiyu ne pişite? (Qələmi dəftərin üstündə gəzdirmək yadından çıxmışdı).

– Tovariş podpolkovnik çernila konçilas, – deyə mızıldana-mızıldana podpolkovnikin gözlərinin içinə yalan danışdı və tez də başını aşağı saldı ki, podpolkovnik yalan danışdığını gözlərindən, sir-sifətindən oxuya

bilməsin. Podpolkovnik heç nə demədi, əlinə bulaşmış təbaşir tozunu lövhənin kənarından asılmış dəsmala sildi, qol cibindən qələmini çıxardıb ona verdi. – Na, pişi! İ ne spi, Aslanov! – dedi.

– Yes! – deyib oturdu və təzə səhifədən podpolkovnikin dediklərini yazmağa başladı.

“TZM – prednaznaçena dlya razqruzki pereqruzki raket.” Daha bir neçə cümlə yazdı, dayandı. Zabitə qulaq asa bilmirdi. Fikri papağın yanında idi.

Saşa bu papağı 250-300-ə verirdi. Artığı lazım deyil, götürək, elə iki yüz manat. Bu pul Vadimlə qış tətili üçün Lvova istirahətimizə bəs eləyər.

Bay, haram olsun sənin kimi oğula. Nə qədər alçaq adamam, ə, mən, heç gör deyirəmmi ki, papağı çıxarıb göstərim ki, bu kimin papağıdı? Yadından çıxıb burda – partanın altında qalıb. Tutaq ki, mənim papağım yaddan çıxıb bir yerdə qalaydı, qaça-qaça qayıdıb gələydim ki, papaq yerində yoxdu, nə edərdim?.. Söyüb batırmazdımmı, o papağı götürəni, o alçağa qarşı məndə hansı hisslər yaranardı? Götürmək nədi, qoy, iyirmi dəqiqədən sonra zəng vurulsun, yiyəsini tapıb papağı verəcəm özünə.

Papaq məsələsini həll edəndən sonra qələmi dəftərin üstündə gəzdirə-gəzdirə, yenə Formanın filmi haqqında fikirləşməyə başladı. Film haqqında fikirləşə-fikirləşə onu da hiss edirdi ki, bu film hamıdan gizli, ürəyinin dərinliyində saxladığı rejissorluq həvə-

sini üzə çıxarıb. Hətta artıq "çəkdiyi" kadrların bəziləri gözlərinin qabağından keçirdi. Kino texnikasından xəbərsiz-ətərsiz, əməlli-başlı film çəkirdi.

***

...Ətrafda nə qədər canlı var idisə, hamısı bir günlük ömürlərini üstlərindən keçirib, üz tutmuşdular gecdənnən hardan çıxmışdılarsa, ora tərəf: mal-qoyun qarınlarını doydurub, təpənin döşü ilə örüşdən qayıdırdı, qazlar, ördəklər qağıldaşa-qağıldaşa çaydan çıxıb, yanlarını basa-basa yiyələrinin qapısına tərəf gedirdilər, yerdə bör-böcək, qarışqalar, göydə quşlar tək-tək gözə dəyirdilər; hamısı yuvalarına çəkilməkdə idilər.

Oğlanla anası da Çınqılın dibindəki tütün şitillərini suvarıb əllərində bel, Ağdaşın altı deyilən təpənin ətəyi ilə tezdən çıxdıqları evlərinə qayıdırdılar.

Oğlana elə gəlirdi ki, təkcə bütün gün ərzində hiss olunmadan gəlib kənddən xeyli aralı sıralanmış dağların üstünə çıxmış günəş dağların arxasında onu gözləyən qan rəngli gölün ağuşuna girməyə tələsmir: dağların üstündən asılıb, öz yuvalarına çəkilməkdə olan canlılara həsrətlə tamaşa eləyirdi, çünki günəş də bütün canlılar kimi, tezdən hansı yuvadan çıxmışdısa, o tərəfə dönmək istəyirdi, onu qoynuna çəkən qanlı gölün qanına bələnmək istəmirdi.

...Anası beli çiynində aparırdı, oğlan isə, belin sapından yapışıb arxasınca sürüyürdü. Anası bir az irəlidə, oğlan isə, onun böyrü ilə gedirdi. Heç biri dinib danışmırdı. Onların ətəyi ilə getdikləri təpənin kölgəsi uzanıb, özündən beş-altı dəfə uzun olmuşdu; təpədən xeyli aralıda axan çayı keçmişdi, üz tutmuşdu çayın o biri üzündə cərgə ilə düzülmüş evlərin həyətinə sarı. Evlərin aynabəndinin, pəncərələrinin şüşələrində işıqlar oynaşırdı. Kölgə can atırdı ki, o işıqları söndürsün və hər yeri öz kölgəsi altına alsın.

... Oğlan indi də gözlərini günəşdən, dağdan-dərədən yığışdırıb, anasının yol çəkən, hərdən səyriyən gözlərinə, illərin sifətində açdığı cizgilərə zilləmişdi. Anasına tamaşa eləyə-eləyə birdən öz-özünə kəşf etdi ki, insanların özləri kimi, danışıqları, oturub-durmaqları kimi, susmaqları da cürbəcür olurmuş: adam var susanda darıxırsan, ona ürəyində acıyırsan, istəyirsən ki, bir şey danışsın, desin, gülsün. Dinib-danışmayanda fikirləşirsən ki, bu nə qədər əfəl, bivec, heç nəyə yarımayan adamdı. Bir başqası susanda özün bilmirsən neyniyəsən, bilmirsən, böyürlərindən sallanan əllərini hara dürtəsən, ayaqlarını necə qoyasan, nə haqda, necə danışasan? Birində özündən zəhlən gedir, o birində susandan.

Anasının susması isə bunların heç birinə oxşamırdı. O, anasının böyrüncə gedə-gedə nə darıxmırdı ki, anası niyə dinib-danışmır, nə də əli, ayağı, özlərinə yer ax-

tarmırdılar. Yol çəkən, səyriyən gözlər, illərin sifətində açdığı cizgilər, oğlanın içini "burub" işə salmışdı. Oğlanın içi, beyni qurulu saat kimi işləyirdi. Təbiət öz dilsiz varlığı ilə adamı necə danışdırırdısa, anası da indi öz susmağı ilə oğlunu həmin dildə danışdırırdı. Oğlan fikirləşirdi ki, Allah bilir, anamın indi səyriyən gözlərinin qabağında, dayaz çayın içi ilə ayaqyalın ağzı yuxarı, ağzı aşağı, suyu sıçrada-sıçrada arıq, çəlimsiz qız uşağımı qaçır (anasının danışığından oğlanın beynində anasının uşaqlığı belə qalmışdı və elə bil suyun içi ilə qaçan o qız uşağını nə vaxtsa, onun özü də görmüşdü), çoxdan dünyalarını dəyişmiş ata-anasınımı xatırlayır, uşaqlarına toymu çaldırır?

Anası danışsaydı, oğlanın fikirləşdiyi şeylərdən biri haqqında danışa bilərdi, susmağı ilə isə oğluna yüz şeyi danışdırırdı.

Birdən anası addımlarının ahəngini pozmadan, sifətində dəyişiklik etmədən, gözlərini yoldan yığışdırmadan, oğluna tərəf baxmadan, beynindəki fikrin davamı kimi, dilləndi ki, bu təpəni şahid çəkib sənə bir şey tapşırıram, çalış ona əməl et. Harda olsan, yadından çıxmasın: Xeyransa xalan öləndən sonra, həmişə ona Quran oxutdur. Xeyransa sonsuzdu, dünyadan izsiz gedəcək.

Hələ dünyasını dəyişməmiş Xeyransa xalası haqqında deyilən bu sözlər, oğlanın içini göyür-göyür göynətdi və bu göynərtini canından çıxartmaq üçün o, nə-

dənsə başını göyə qaldırıb it kimi ulamaq istədi. Başını yuxarı qaldırdı, amma ulaya bilmədi. İçinin göynərtisi vurub bəbəyini yandıra-yandıra gözlərini yaşla doldurdu, ayağının altını görmədi, səndirlədi, gözlərini yumub açdı. Gözünün içinə yayılmış yaş yığılıb yanağına süzüldü.

Sonrakı sözləri elə bil qeybdən eşidirdi.

... Allah-Təalanın işindən də baş açmaq olmur. O bədbəxt görən, neyniyəcəkdi başdan-ayağa əclaflarla dolu olan bu boyda dünyaya, heç olmasa, özü kimi bir mayıf uşaq gətirməklə? Dünyanın gedişimi dəyişəcəkdi?... Xeyransanın özünü belə yaradajaydısa, neynirdi yaradıf? Bizə göz dağımı eləmək istəyirdi?

...Anası bayaqdan, anadangəlmə topal olan, qıvrıla-qıvrıla, min bir əziyyətlə yeriyən, dünyaya qız gəlib, qız qarıyan, özündən böyük bacısı Xeyransa haqqında fikirləşirmiş. Yol çəkən, səyriyən gözlərinin qabağında nə balaca qız uşağı qaçırmış, nə də oğluna-qızına toy çaldırırmış.

...Oğlana birdən gün kimi o da aydın oldu ki, öz susmağı ilə adama yüz şey danışdıran, darıxmağa qoymayan gözlərin, sifətin yiyəsi ancaq belə şeylər haqqında fikirləşə bilər.

...Kölgə artıq uzanıb şüşələrdə oynaşan işıqları söndürmüşdü, onların varlıqlarından əsər-əlamət qoymamışdı. Və göz işlədikcə hər tərəfi Kölgə öz kölgəsi altına almışdı: günəş kəndin kənarında sıralanmış dağların arxasındakı qan gölünə düşürdü.

...Kölgəsi hər yanı basmış təpənin ətəyi ilə, oğlan anasıyla tütün suvarmaqdan qayıdırdı. Nə oğlan danışırdı, nə anası. Anası beli çiynində aparırdı. Yol çəkən gözləri də yuvasından dikəlib daha tez-tez səyriyirdi, elə bil onu harasa, heç kimin görmədiyi, bilmədiyi, təkcə o bir cüt gözə bəyan olan sehirli bir aləmə tərəf çəkib aparırdı. Anası yüngül addımlarla, nəfəsini belə dərmədən onu sehirli aləmə tərəf çəkib aparan bu bir cüt gözün dalınca gedirdi...

Oğlan isə belin sapından yapışıb dalınca sürüyürdü. Və elə bil oğlan beli sürümürdü, bel onu arxadan itələyə-itələyə anasının ardınca aparırdı...

***

Zəng vuruldu. “Stop” – deyə filmin çəkilişini saxladı, öz-özünə gülümsədi. Fikirləşdi ki, görəsən bu yanğını ürəksiz, hissiz dəmir-dümürlə də lentə köçürüb dilləndirmək olarmı? Çiyinlərini çəkdi. İstədi ayağa dursun, dəhlizə çıxsın. Papaq yadına düşdü, əlini partanın altına salıb, papağın yumşaq tükləri üstündə gəzdirib, fikrini dəyişdi: “Yaxşısı budur, özümü elə göstərim ki, guya heç partanın altında qalmış papaqdan xəbərim olmayıb, yəqin ki, papağın sahibi qapının arxasında zəngin vurulmasını gözləyir, bu saat gəlib papağını götürəcək”.

Dəhlizə çıxdı. Dəhlizdə də ki, Allah göstərməsin, siqaretdən o qədər çəkib üfürürdülər ki, nə göz-gözü görürdü, nə də nəfəs almaq mümkünüydü. Köhnə rektorun vaxtında, korpuslarda siqaret çəkmək olmazdı. Çəkənləri müəyyən yollarla cəzalandırırdılar: töhmət verirdilər, təqaüdünü kəsirdilər, bir adam iki-üç dəfə tutulsa institutdan qovurdular. Bu yaxınlarda institutlarına təzə rektor təyin etmişdilər. Təzə rektorun özü qabaqkı rektordan fərqli olaraq siqaret çəkdiyindən əmr-zad yaddan çıxmışdı, vur çatlasınıydı.

Beş dəqiqə bu üfunətdə nəfəs aldıqdan sonra (özü siqaret çəkən olsaydı nə var idi ki) yenə bürkülü sinfə doluşdular, hərə öz yerində oturdu. Yerində oturan kimi, əlini partanın altına uzatdı. Əli papağın yumşaq, sərin tükünə toxunanda, ürəyində sevinc mehi dolaşdı və bəzi şeyləri təzədən haqq-hesaba vurmağa başladı.

Yeganə kostyumunu, Allah bilir, neçə il idi geyinirdi. Hərdən kostyum haqqında fikirləşəndə, ona elə gəlirdi ki, elə dünyaya bu boyda, bu buxunda və bu boy-buxuna biçilmiş bu kostyumda gəlib. Di gəl, belə baxanda kostyum elə bərbad da deyildi. Amma orasında idi ki, kostyumu neçə illər ərzində belə saxlamışdı: hər yerə geyinməzdi, geyinəndə oturuşuna-duruşuna fikir verərdi, içəri girən kimi də soyunub çiyinliyə keçirərdi, şkafdan asardı. Ancaq illər də kostyumun üstündən izsiz ötməmişdi, yuyulmaqdan, ütülənməkdən əvvəlki rəngindən əsər-əlamət qalmamışdı. Bir də şal-

var lap süzülmüşdü. Qaldırıb günə tutanda, bu üzdən o biri üzü görünürdü. Kostyum az qalırdı dilə gəlsin ki, bəsdi məni əyninə keçirib düzü-dünyanı dolaşdığın, mənim kostyumluq ömrüm çoxdan bitib, burax, gedim ində də "əsgilik" ömrümü yaşayım; küncün-bucağın tozunu alım, döşəməni silim, sonra da qıvrılıb bir yerdə rahat mürgü vurum.

Neçə dəfə istəmişdi, evə məktub yazsın ki, "mənə pul göndərin", üzü gəlməmişdi. Məktubları yarımçıq cırıb atmışdı. Bir tərəfdən də yekəxana Vadimə söz verməyi ki, qış tətilində bir yerdə Lvova gedək, xizək sürməyə. Bütün bunlara na qədər pul lazım idi. Evdəki yazıqlarda pul hardan idi. Özündən başqa hələ evdə iki qardaşı, altı bacısı var idi.

O fikirləşirdi:

...Anamın, tütünə gedən bacılarımın zülmlə qazandıqları bu böyüklükdə ailənin qənd-çayına ancaq çatmırmı? Bilmirəm, aydan-aya mənə pulu hardan göndərirlər? Tütündən onsuz da bir şey çıxmırdı, əzab-əziyyəti də ki, Allah göstərməsin, deyiləsi deyildi. Bütün ilboyu dırnaqla gor eşən kimi, bacılarımla anam gör eşirdilər, tütün becərirdilər, pərvanə şamın başına fırlanan kimi, hər şitilin başına fır-fır fırlanıb onları böyüdürdülər; yığırdılar, qurudurdular, tay basırdılar. Tayları neçə dəfə qışın şaxtasında rayondakı tütün qəbuletmə məntəqəsinə aparırdılar. İşləməkdən sual işarəsi kimi əyrim-üyrüm bacılarımın, bir dəri, bir sümük olan xəstə ana-

mın bir ilə yaxın üstündə əsə-əsə becərib, bağladıqları tayları məntəqədəki qıpqırmızı, sir-sifətindən yağ daman, "əjdaha yarım" kişilər bir dəqiqənin içində dağım-dağım eləyirdilər. Hər tayın çəkisindən 5-10 kilo kəsə-kəsə, üçüncü, dördüncü sortla birtəhər qəbul eləyirdilər (adamı elə kökə salırdılar ki, hələ onların canına, arvad-uşaqlarının canına dua da eləyirdin). Bir iki yüz-üç yüz gün əmək günü çıxırdı, ona da, bir, ya iki manatla kolxoz pul bölürdü, o pul da ki, il ərzində heç kolxozdan aldıqları avansları ödəmirdi.

Yazıqlar yenə zülmlə, birtəhər mal-qoyun saxlayırlar, düşdükcə satırlar, pulundan mənə göndərirlər ki, oğlumuz qoy korluq çəkməsin, oxusun. Papağı götürsəm, yenə evdəkiləri az-maz qabağa salaram.

... Bir tərəfdən də belə papağın yiyəsi, elə o "əjdaha yarımlardan" olar, yəqin ki, ya alverçidir, ya da atasımı, anasımı "levi" yollarla pul qazananlardandır. Tələbə ola-ola belə bahalı papaqda gəzirsə, onlardan olar. Papağı belədirsə, hər halda papağına da uyğun paltosu, dublyonkası, ayaqqabısı, sapojkisi, pal-paltarı, isveç, ya yapon saatı olmalıdır. Necə deyərlər, belə adamların malını götürmək savabdı.

... Axı, bir tərəfdən də, bəlkə papağın yiyəsi bu papağı boğazından kəsib, qəpik-qəpik yığmaqla alıb? Elə bu cür papağa vərdiş etmədiyindən, indi yeganə "qiymətli" şeyini yadından çıxarıb partanın altında qoyub gedib. Gör nə qədər huşsuzdu, tənəffüs vaxtı da yadına

düşməyib ki, axı mən səhər-səhər dərsə gələndə başımda papaq var idi, indi hanı o papaq?..

... Əl çək, qağa, bu filosofluqdan əl çək! Götürürsən, ya yox?.. Yaxşı, Vadimə papaq haqqında bir şey deyim?!

Vadimə desəm, gərək şərik olaq. Qardaş malı kimi: yüzü onun, yüzü də mənim. Yüz manatı, deməli, itirirəm. Bəlkə?.. Yox! Deyirlər artıq tamah baş yarar.

Atalar sözü ilə danışmağına gülümsədi və sifətinə təbəssüm yayılmasını Vadim o saat sezdi, başı ilə soruşdu ki, "nə olub?"

Əli ilə bildirdi ki: Heç!

...Bir də artıq tamah öz yerində, tək götürsəm, sinifdən necə çıxardaram? Xəbər tutarlar, özüm cəhənnəm, millətin adı batıb gedər (qrupda o, millətinin yeganə nümayəndəsi idi). Yenə iki nəfər olanda tutulsan ikilikdə fikirləşib bir şey demək olar, bir də axı, Vadimin belə şeylərdə səriştəsi var, deməli, hökmən Vadimlə məsləhətləşmək lazımdır.

Dəftərin ağ vərəqinə yoldaş podpolkovnikin qələmi ilə "Vadim, kimsə papağını yaddan çıxarıb partanın altına qoyub, əla şeydi" – yazdı və Vadimi dümsüklədi, işarə etdi ki, vərəqi oxusun. Vadim yazını oxuyan kimi sifətində bir dəyişiklik olmadan əlini partanın altına saldı, papağa əl gəzdirdi və baş barmağını dikəldib mala qiymət qoydu: "Əladı!" Sonra qaş-gözlə soruşdu ki, "götürək?"

O, dəftərə yazdığı "xəbəri" yaxşı-yaxşı qaralaya-qaralaya başı ilə razılığını bildirdi.

Deyəsən, onların him-cimlə danışmaqlarını podpolkovnik hiss eləmişdi, ona görə Vadim əli ilə işarə elədi ki, "sonra". Və o da başladı yalandan qələmi dəftərin üstündə gəzdirməyə.

***

Lvovda istirahət edəndə vaxtın olmadığındanmı, günlərin şən keçdiyindənmi, ağlına belə gəlməmişdi ki, axı, xərclədikləri bu pullar haram pullardı?

Allah onlar üçün xoş günlər yetirmişdi. Deyirdilər, gülürdülər, rəqs edirdilər, qəşəng qızlarla tanış olurdular, axşamlar onlara qonaq gedirdilər… gündüzlər xizəklə dağa qalxırdılar. Nə isə, çox şeylər yaddan çıxmışdı, pulların necə qazanılması da onlarla birlikdə. Pul idi, bir də onlar, lazım olduqca, bala-bala xərcləyirdilər.

...İstirahətlərini başa vurub, Lvov-Kiyev qatarında Kiyevə qayıdırdılar. Kupedə ikinci yarusda yataqda uzanıb gözlərini dirəmişdi alatoranlıq tavana. Heç cür yuxuya gedə bilmirdi. Hey özünü söyürdu ki, niyə mənə verilən bu qısa ömrü insan kimi yaşaya bilmirəm? Niyə özüm öz əlimdə oyuncağa çevrilmişəm? Axı niyə mən bədbəxt özüm-özümlə bacara bilmirəm? Niyə?

Özünü söyürdü, yanıb yaxılırdı, partlayırdı, amma ürəyinin lap dərinliyində, ucundan-qulağından onu

da hiss eləyirdi ki, bu hisslər keçicidir, sabah yuxudan duranda bu hisslər çəkilib gedəcək, yenə həmin adam olacaq və beləcə ömrünün axırına çıxacaq. Bu duyğu canından keçəndə lap dəli olurdu, hirslə ağzı üstə fırlanırdı, rahatlana bilməyib, bir də arxası üstə çevrilirdi.

***

...Yenə yuxusuna heç kimə uyuşmuyan, sakit, hirsləndirəndə özündən gedən həmin o oğlan uşağı gəlib girmişdi.

Dədəsi ilə qoyun növbəsinə getmişdi, günortanın isti vaxtıydı, qoyunlar baş-başa verib təpənin döşündə yatışırdılar. Dədəsi də yatırdı, başının altına çörək qabını qoymuşdu, arxası üstə uzanmışdı, qıçlarını dizdən yığmışdı (dədəsi gecələr də belə yatırdı). Kepkasını gözünün üstünə endirmişdi, nəfəsi də həmişəki kimi dərindən burnuyla alırdı, "puff" eliyib ağzından eşiyə buraxırdı. Oğlan isə outrub təpənin sinəsində açılmış saysız-hesabsız siçan deşiklərinə, həmin deşikləri bir-biri ilə birləşdirən qatmaqarışıq, lakin aydın seçilən izlərə tamaşa eləyirdi. Hərdən deşiklərin birindən siçan çıxırdı, həmin izlərlə, çox sürətlə bir deşikdən o birinə qaçırdı, yox olurdu. Bir azdan başqa deşikdən həmin siçanmı, ya başqa birisimi çıxırdı, həmin cığırlarla o deşiyin yanına qaçırdı, bu deşiyin yanına qaçırdı, axırda

da, deşiklərin birinə girib yoxa çıxırdı. Oğlanı bu tamaşadan dədəsinin “taxıla gedən qoyunları qaytar” deməsi ayırdı. Şallağın sapını dayaq eləyib durdu, taxıla tərəf gedən 15-20 qoyunun dalınca yüyürdü.

Oğlan qoyun növbəsinə gəlməsi ilə fəxr eləyirdi, deməli, kişiləşmişdi, o da nəyəsə yarayırdı. Yoxsa, dədəsi həmişə qoyun otarmağa ondan böyük bacılarından birini aparırdı, onlar da axşam qayıdanda özlərin lap böyüklər kimi aparırdılar; əllərindəki şey-şüyləri ora-bura tullayırdılar, üst paltarlarını çıxarıb döşəmənin üstünəmi, taxtın bir küncünəmi atırdılar, əllərini-üzlərini yuyurdular, “off!” eliyib taxtın üstünə çıxırdılar. Anası tələsik onlara çay gətirirdi, onların adına kəsilmiş toyuq ətindən çəkib qabaqlarına qoyurdu. Bacıları da lap böyüklər kimi başlayırdılar özlərini yorğun-arğın göstərə-göstərə, çaydan içməyə, toyuq ətindən yeməyə.

Oğlan isə bütün günü evdə-eşikdə olduğundan bacılarına paxıllığı tuturdu, istəyirdi ki, o da bacıları kimi qoyun otarmaqdan gəlsin, anası da ona gülümsəyə-gülümsəyə, tələsə-tələsə çay gətirsin, yemək gətirsin. O da dədəsi kimi çayı içib, stəkanı irəli itələsin; yəni birini də. Qabı qabağına çəkib iştahla toyuq ətindən canına döşəsin. Dədəsinə hey deyirdi ki, məni də özünlə apar, dədəsi də söz verirdi ki, yaxşı, apararam: şey-şüyünü, şallağını, çomağını hazırla, sabah gedərik. O da axşamdan həvəslə hər şeyini hazırlayıb bir tərəfə

yığardı, sevincdən gözünə yuxu getməzdi. Gecənin bir vədəsi yuxu onu aparardı və bir də ayılardı ki, dədəsi qızlarından birini götürüb gedib, onu isə qaldırmayıb. Başlayardı ağlamağa, sızlamağa, cumardı anasının üstünə ki, niyə məni qaldırmayıbsınız? Çox şüvəndən sonra, anası onu sakitləşdirib deyərdi ki, "elə şirin-şirin yatırdın ki, qıyıf qaldırmadıx, heşdad olmaz, gələn sıra gedərsən".

Səbirsizliklə bir aydan sonra gələn növbəni gözləyərdi.

O gün gəlib çatmışdı. Dədəsi onu birinci dəfə qoyun otarmaq sırasına gətirmişdi və indi dədəsinin bütün dediklərinə canla-başla əməl edirdi ki, dədəsi həmişə onu özüylə gətirsin.

Dünyanın həmin o xoşbəxt balaca oğlan uşağı, içi sevinc işığı ilə dolu, əlində şallağını yelləyə-yelləyə sürüdən ayrılmış qoyunların dalınca qaçırdı.

O isə hələ gələcək yaşantılardan xəbərsiz olan o xoşbəxt oğlan uşağının arxasınca baxırdı və hönkürə-hönkürə ağlayırdı.

...Birdən hövlnak yuxudan ayıldı, sir-sifəti göz yaşına bələnmişdi. Vadimin aşağıda şirin-şirin yatdığını görən kimi, harada olduğunu dərk elədi və tez paltarını geyinməyə başladı. Bilmirdi gecənin bu vədəsində hansı dayanacaq olacaq, hara getmək istəyir? Bir onu bilirdi ki, hələ ki, Vadim yuxudan oyanmayıb, bu dar kupeni, qatarı tərk etsin, içində öldürdüyü o uşağın ruhu ilə tək-tənha qalsın.

...Bir də bu gecənin gec vədəsində ona gün kimi aydın idi ki, o uşaq paklığının yanında Lvovda keçirdiyi günlər, çəkdiyi keflər, ümumiyyətlə, hər şey, hər şey yalan idi, yalan. Və o hissləri heç kimlə bölüşmək mümkün deyildi. Ona görə ayağının altında torpaq, başının üstündə sayrışan ulduzlar, canında o oğlan uşağının ruhu, bu qış gecəsinin sakitliyində tək-tənha qalmaq istəyirdi, tək-tənha!

*"Ulduz" jurnalı, 1989-cu il, N-11*

# ŞEYTAN ƏMƏLİ

*İki bacının – anam Qubanın,*
*xalam Gülöyşənin əziz xatirəsinə*

Dişin, başın, qulağın ağrılarına yaxşı bələd idi. Allah heç kimin başına gətirməsin, dözülməz ağrılardı. Amma bu zəhrimar qolun necə məharətlə ağrıdığını hələ ki, duymamışdı və heç zaman ağlına gəlməzdi ki, qol da bu cür ağrıya bilər. Və bu ağrını duymaq xoşbəxtliyi nə vaxtsa ona nəsib olacaq. İki gecə idi ki, qolunun zoqqultusundan yata bilmirdi, yerindəcə, nağarasız, qarmonsuz başlayırdı oynamağa: əlini gah yastığın altına soxurdu, gah çarpayıdan aşağı sallayırdı, gah da dik qaldırıb göydə tuturdu ki, bəlkə bu şoqəribin zoqqultusu kəsə, amma xeyri olmurdu ki, olmurdu. Sanki ürəyi sağ qolunda döyünürdü və bu ürək hər dəfə yumulub açıldıqca, nasos kimi bütün bədəninə dözülməz ağrılar üfürürdü.

Bu zoqqultunun təsirindən yaranan ağrıya dözməkdənsə, qolunun yerli dibli kəsilib atılmasına razı idi. Amma qolunun kəsilib atılması məsələsi fikrindən keçəndə yadına düşürdü ki, sağ əlidi. Sağ əl isə hər şey-

dən əvvəl ona yazmaq üçün lazım idi. Bir də fikirləşirdi ki, cəhənnəmə, Ənvər müəllim sol əli ilə yazmağı necə öyrənib, mən də onun kimi öyrənərəm.

Gecələr qolunun zoqqultusu başlayanda başına belə gic-gic fikirlər gəlirdi. Gündüzlər isə ağrı tamam çəkildiyindən fikirləşirdi ki, daha gecə ağrımaz və tənbəllik edib xəstəxanaya getmirdi. Bu gün isə dünən gecəki təkrar ağrıdan sonra, özü-özünə söz vermişdi və gəlmişdi öz tələbə poliklinikalarına.

Hələ növbəsinin çatmasına çox vardı. Bir işlə məşğul olmadan, boş-boşuna oturduğundan yenə harda axmaq fikirlər vardısa gəlib tezcə onu tapmışdılar, ya da nə fərqi, özü həmin fikirləri başına toplamışdı.

Hələ ki, necə deyərlər, özünü araşdırmaqla məşğul idi. Nə işlərlə məşğul olduğunu, ümumiyyətlə kimə, nəyə lazım olduğunu haqq-hesaba çəkirdi. Belə "özünü təftişlərdən" sonra həmişə özü-özünə vədlər verməyə başlayırdı; "Bu gündən vaxtımı hara gəldi sovurmayacam, uşaqlarla boş-boşuna laqqırtı vurmayacam, veyillənməyəcəm, söz verirəm ki, filan işi filan edəcəm dediklərimi etməsəm, əclafın yekəsiyəm" və s. və i.a. Bu vədli anların ötəri olduğunu bilirdi. Ona görə də əlini hirslə yelləyib dikəldi, kürəyini oturduğu kreslonun söykənəcəyinə sıxdı və onun kimi növbə gözləyən xəstələri nəzərdən kecirməyə başladı.

Hər iki divar boyu, kabinetlərin qapıları arasındakı boş yerlərdə kreslolar düzülmüşdü. Bu kreslolarda otu-

ran xəstələrin kimisi dizinin üstündə tutduğu kitabı, ya mühazirə dəftərini oxuyurdu, kimisi bu dünyadan tamam ayrılıb, gözlərini məçhul bir nöqtəyə zilləmişdi, dərin xəyala dalmışdı. Hərdən sifətlərinə daxili sevincin təsirindən işartı, ya qəmin təsirindən kölgə gəlirdi. Bəziləri daş parçası kimi oturduğu yerdə donub qalmışdı; – sir-sifətlərindən bir şey oxumaq mümkün deyildi, belələrinə çox baxanda adamın içi üşüyürdü. Kimisi də gəzişirdilər və gəzinə-gəzinə gözaltı oturanlara baxırdılar ki, kreslodan durub eləyən olsa, tez özlərini versinlər boş yerə.

Dəhlizin o başındakı kabinetlərin birinin ağzına çoxlu adam toplaşmışdı, arı beçə verəndə analarının qonduğu yerdə qaynaşdıqları kimi yaman qaynaşırdılar.

Xəstələrə baxa-baxa yadına nə vaxtsa, hardasa oxuduğu bir fikir düşdü.

Orda deyilirdi ki, bütün ömrümüz boyu, kiçik xəstəliklərdən müalicə oluna-oluna çalışırıq ki, özümüzü böyük ölümə sağ-salamat gətirib çatdıraq.

Bu fikir başından keçəndə, babasının qurbanlıq üçün bordadığı toğlular gəlib gözlərinin qabağında durdular. İstər-istəməz gülümsədi.

Elə, biz də o toğlular kimi bir şeyik. Babam toğluları bordayır, istidən-soyuqdan gözləyir, qoyunun içinə buraxmır, yaxşı, qüvvətli yemlər verir, kökəldir, lazım olanda onlara həkimlik edir, qurbanlıq vaxtı çatanda da

kəsir. Biz isə belə alınır ki, hərəmiz özümüz-özümüzü, öz bildiyimiz kimi bordayırıq ölüm üçün...

Ənvər müəllim demişkən, dəlinin arxasına vaqon-zad qoşmurlar ki, vallah, mən də belə dəliyəm. Boş-boşuna oturub, ağlıma gələni sayağlamaq əvəzinə, çıxardıb mühazirə dəftərimi oxumuram! Özü də sabah yox, birisi gün imtahandır, axırıncı imtahan! Çantasından professor Ornatskinin "Qidrodinamika i teploobmen paroqenerujuşix kanalov" fənnindən oxuduğu mühazirə dəftərini çıxardı.

Mühazirədən bir-iki səhifə oxumamışdı ki, evlərinə getmək məsələsi yadına düşdü və o dəqiqə ürəyini böyük bir sevinc hissi bürüdü. Deməli, birisi gün axırıncı imtahanı verib uçuram evə. Kefdəyəm, vallah! Az qaldı sevincindən, ondan bir az aralıda oturub mühazirə dəftərini oxuyan suyu şirin qızın dəftərini əlindən alsın, gücü çatdıqca dəhliz boyu qımçırlasın ağzı aşağı və qızın o üzündən, bu üzündən marça-marçla öpsün. Özünü zorla saxladı bu istəkdən.

Bir ilə yaxın idi ki, evlərində olmurdu. Ev üçün burnunun ucu göynəyirdi. Fikirləşdi ki, gör mən belə darıxanda anam, bacı-qardaşlarım, dostlarım mənim üçün indi necə darıxıblar.

Xəyalən artıq evdəydi, oturduğu kresloya yayılıb xoşbəxtlik dənizində üzürdü.

***

...Bala, qadan alım, indi Allah qoysa, oxuyuf qurtarandan sonra, səni hansı vəzifəyə qoyajaxlar? Bala, and olsun Allaha, sənin heç nəyin bizə lazım deyil, qoca adamlarıq, bir ayağımız gordadır, bir ayağımız burda, hay-hayımız gedif, vay-vayımız qalıf. Birjə sənin adını istəyirik, adını. Qoy desinlər ki, filankəsin oğlu urusetdə ağılnan başnan oxuyuf qurtardı, indi də filan yerdə filan vəzifədə işdəyir. Bax, biz də sənin quruja adınla – adın sanı yaşa, bala – qurrələnək, bunu bizə sən çox görmə. Təzədən nə sənin aldığını geyinənik, nə də yeyən. Hamımız gözümüzü sənə dikmişik. Yoxsa ki, sən də gedib oxşamışlarına oxşasan, hec nə.

Yox! Sən mənim ağıllı balamsan, özüm elə deyirəm, qadan alım.

***

Ə...ə, Abbas, ət, yağ tapılırmı oralarda? Yağ-zad elə boldursa, pasılka elə yavaş-yavaş, burda verək getsin. Üç qat qiymətinə olmasa da, iki qat qiymətinə nəğd gedəcək. Vallah, mənə xeyri-zadı lazım deyil, tələbə adamsan, nə çıxsa göndərərəm özünə. Bir də qurtarmağına az qalır, ora ki, bolluqdur. Vallah, bala ağlın olsun heç buralara gəlib eləmə. Bir təhər, fırıldaqla-zadla iliş qal oralarda. Odu ey, Moşunun oğlu Moskvada bir

qoca alkaş arvadla evlənib yanına propiska olubmuş, bu yaxınlarda arvad ölüb, iki otaqlı ev qalıb ona, indi Moskva kimi yerdə iki otaqlı evi-eşiyi, nə istəyirsən, bəy kimi dolanır. Gör bir eləsini də sən özünə tapa bilirsənmi? Gəlib burda neyləyəcəksən? Bolluqdan başqa, bala, o tərəflərdə az-çox düzlük də var.

Görürsən məni? Sənin də mənim kimi adamın yox, pulun yox, ömrünün axırına kimi, yüz neçə manatamı qulluq edəcəksən? Hələ təksən, başına bir elə batmır, sonra arvad-uşaq yaxandan yapışanda o qədər kəllənə döyəcən ki, bax, onda gec olacaq. Bala, özü də hər deyilənə, yazılana inanma! Bu saat hər şeyi pul və dayı həll edir. Bu ikisindən biri varındısa, həyatda yerin də var. Yox, əgər mən gündəsənsə, inistitut yox ey, haranı qurtarırsansa qurtar, havayı işdir: hədər zəhmətdir, elə qal oğlu qalsan. Nə qalıb institutu qurtarmağına, Allah qoysa, gəlib hamısını özün, öz gözlərinlə görəcəksən...

Bir şey gətirməyibsən ki? Varındırsa istəyən var, gətir, verim getsin. Yoxdur da, yoxdur. Elə söz gəlişi dedim.

***

...Qonşu kənddən Ciqan Xaçiqyanı bizə təzə sədr göndəriblər. Köhnə sədrimizi canavar Əfəndinin yerinə qarajın müdiri qoydular. Canavar Əfəndini bij Ağakərəmin yerinə kənd sovetinin sədri qoydular. Mal ferma müdiri cücə Səmədi çıxartdılar, eşşək Dadaşın

yerinə qoyun ferma müdiri qoydular. Qoyun ferma müdiri eşşək Dadaşı də çıxartdılar, cücə Səmədin yernə mal ferma müdiri qoydular. Tır-tır Ağahüseyni anasının əmcəyini kəsən Balahüseynin yerinə ambardar qoydular. Anasının əmcəyini kəsən Balahüseyni qırmızı Raufun yerinə partiya təşkilat katibi qoydular. Qırmızı Raufu Tır-tır Ağahüseynin yerinə hesabdar qoydular. Bij Kərəmi qonşu kəndə sədr göndərdilər... Bir sözlə vəzifədə olanların hörüklərini dəyişdilər.

***

Həə, ağıllı balam, yadında qalsın ki, insan deyilən məxluq var haa, onun başı o, on il oxuduğun məktəbdəki qenerator kimi bir şeydi.

Baax, generatoru niyə işlədirlər? – Enerji istehsal eləmək üçün. Eləmi? Bəə, baş niyə işləyir? – Heç olmasa, heç olmasa yiyəsini ağ günə çıxartmaq üçün! Hər ikisi işləyəndə enerji alınır. Tutaq ki, hər bir generatorun və başın verdiyi enerji ilə bir lampa yanır. Deməli, onda nə qədər çox generator – baş işləsə, bir o qədər də, çoxlu sayda lampa yanar. Allaha şükür, neçə milyonlarla başlar var. Di gəl, nə olsun, qoyurlar ki, hər baş işləyib bir lampa yandıra. Çox olsa, yüz-iki yüz lampa yanır. Yüz-iki yüz lampa da ki, axı bu boyda ölkəni işıqlandıra bilməz! Baax, buna görə biz bədbəxtlər qaranlıqda qalmışıq!

***

Bir də gözünü açdı ki, “xoşbəxtlik dəryasında” boğulur. Hər evə gedəndə, bir balaca sevincdən sonra, həmişə təkrar olunan bu söhbətlər yadına düşəndə nə bayaqkı sevincdən əsər-əlamət qalmışdı, nə də bayaqkı evə uçmaq həvəsi, leş kimi oturduğu kresloya sərili qalmışdı.

Elə bil, dərd-qəm üçün yaranmışam mən bədbəxt – deyib yerində qurcuxmağa başladı...

...Dəhliz boyu üzü ona tərəf ucaboy bir qız addımlayırdı. Bədəninə nazik, parıltılı tünd göy rəngli kofta geyinmişdi. Yeridikcə kofta dalğalanaraq qızın yumru, dolu, başı buraxılmış dik döşlərini nə qədər görünməz etməyə çalışırdısa bir şey alınmırdı, əksinə, onların varlığını daha da gözə soxurdu.

Sağ qoltuğunun altında, ensiz, tutacaqsız, qara dəri materialdan tikilmiş əl çantası var idi. Qollarının ikisi də sərbəst aşağı buraxılmışdı. Bədən arıq, incə, əndamı dolu idi qızın. Açıq mavi rəngli lostik parçadan geyindiyi yuxarıdan gen, aşağı ayağına doğru getdikcə daralan şalvar yeridikcə uzun yaraşıqlı qıçlarına hopurdu. Qıçlarına hopmuş şalvarın altından bütün cizgiləri ilə duyulan əndam, koftanın əmələ gəyiridiyi dalğaların arasından baş qaldıran döşlər, üstünə nəm düşmüş lətif, ətli dodaq onun beynini, içini-içalatını işıqlandırırdı, isindirirdi.

Qızın atdığı addımlar, ətrafındakıları seyr edən baxışları, ondakı əda, ümumiyyətlə, onun bütün varlığı “qarğa, məndə qoz var” deyirdi.

Qızın birdən-birə dəhlizdə peyda olması ona öz varlığını unutdurmuşdu. Gözlərində hər şeyi gözəlləşdirmişdi, indi ətrafında oturan, ayaq üstə duran xəstələrə, ümumiyyətlə hər şeyə başqa gözlə baxırdı, hər şey ona doğmalaşmışdı. Elə bil qızın xarici gözəlliyi, təmizliyi onun daxilinin təmizdəyirdi, saflaşdırırdı, şənləndirirdi, gücləndirirdi.

Qız gəlib onunla üzbə-üz olan 312-ci kabinetin qapısı ağzında dayandı. Məlahətli səslə “bir dəqiqə” – deyib cavab gözləmədən kabinetə girdi.

Qız içəri girəndən sonra başı ayazımağa başladı və bir azdan yadına düşdü ki, bayaq nələr fikirləşirdi, necə qəm-qüssəyə dalmışdı, hansı aləmdəydi! Qızı görəndən sonra hansı aləmə düşmüşdü.

***

...Sən bir qızdakı qüvvəyə bax, haa! – deyib gülümsəməyə başladı. Yavaş-yavaş gülümsəməyi qəh-qəhəyə çevrildi. Öz-özünə gülmək çoxdankı xasiyyəti idi. İndi isə, bayaqdan özünü söyməklə, mühazirə dəftərinin köməyi ilə başından qovmaq istədiyi, lakin qova bilmədiyi fikirlərin qoparağını, camaata qırtım satan qızın gəlişi ilə, necə götürüldüyünə gülürdü. Dəhlizdəkilə-

rin nəzəri yavaş-yavaş ona tərəf yönəlirdi, ona tuşlanan gözlərin yiyələrinin sifətində əvvəlcə, qəzəb, hirs var idi, bir azdan sifətlərdəki hirs, qəzəb cizgiləri ona qarşı dərin bir yazıqlıq hissi ilə əvəz olundu; gülüşunu saxlaya bilmirdi. Və bu sifət sahibləri fikirləşirdilər ki, heyif, bu cür yaraşıqlı, boylu-buxunlu cavan oğlana, belə baxanda kimin ağlına gələrdi ki, yazıq ağıldan mayıfdı. Bir az keçəndən sonra, ona tərəf baxmağı günah sayıb, hamı gözünü ondan çəkdi. Və o heç kimə fikir verməәdən yerindən durdu, bayaq öz yerişi ilə dünyaya naz, qəmzə atan qızın addımladığı dəhliz boyunca, sonra da pilləkənlərlə aşağı qaçdı.

Xəstəxanadan çıxanda gülməkdən yaşlanmış gözlərini qurulayırdı. Xeyli davam edən gülüşdən sonra özündə əməlli başdı yüngüllük hiss eliyirdi. Bir tərəfdən də küçədə havanın bu cür günəşli, hər tərəfin yam-yaşıl olması kefini lap açırdı. Təzə-təzə çiçəklənməyə başlayan ağacın altında dayanıb onun hərəkətlərinə fikir verən qıza ürəkdən bir göz vurdu, sonra dayanmayıb maşın yolu boyunca çəkilmiş, o qədər də hündür olmayan dəmir çəpərin üstündən hoppandı. Tələbə parkına tərəf qaçdı. Daxilindəki sevinc hissi, sanki ona qanad vermişdi və o tələbə parkına tərəf qaça-qaça yox, uça-uça gedirdi. Xəstəxanaya nə səbəbə gəldiyini tamam yadından çıxarmışdı.

***

Səhər ertə park kimsəsiz idi, yazın gəlişi ilə yarpaqların ağırlaşdırdığı ağaclar, səhər günəşin altında ağrın-ağrın yırğalanırdılar. Yırğalanan ağaclardan onun üst-başına şeh damcıları sıçraşırdı. O, üstünə düşən şeh damcılarına fikir vermədən, parkın dərinliyinə doğru addımlayırdı. Bu xışıltılı yarpaqların şeh damcıları altında yadına bapbalaca uşaq vaxtı anasının danışdığı bir nağıl düşmüşdü, nağılı fikirindən keçirib xəfifcə gülümsəyirdi. Bədəni, beyni tam sakit olsun deyə, bu ağacların birinin altına qoyulmuş oturacağa çökdü, anasını bütün varlığı ilə gözünün qabağına gətirdi, onun danışdığı nağıla qulaq asmağa başladı. Anası danışırdı ki, Allah taala hər bir insanı dünyaya xəlq eləyəndə onun beyninə şeytan qoyub və bu şeytan həmişə insanın beynini qurdalayıb, onu dünya malına şirnikləndirir; axirət gününü onlara unutdurur, insanlar da şeytanın əməlinə uyuyub, dünya malından ötrü bir-biriləri ilə vuruşurlar, başlar kəsirlər, qanlar tökürlər, bacardıqca çoxlu mal dövlət, pul yığmağa çalışırlar, səhərdən axşama kimi qan-tər içində işləyirlər.

Peyğəmbərlərdən hansısa uzun müddət bu ədalətsizliyi müşahidə eliyəndən sonra, bir gün dözə bilməyib, əllərini göyə açır, Allah taalanı səsləyir ki, Ya Allah canım sənə fəda, sən ki, yer üzünün adil Allahısan, niyə bu şeytanı insanların beyninə salıb onları dünya malına

aldadırsan, başlarına min oyun açırsan, qoymursan onlara verilmiş qısa ömrü dinc adam kimi yaşayalar?

Allah taaladan səda gəlir ki, ya peyğəmbər, neynək, qoy indən belə, sən deyən kimi olsun; sabahdan insanların beynindən şeytanı yox eliyərəm.

Sabah açılır, peyğəmbər görür ki, dünyanın hər yerində bütün müharibələr dayanıb, nə çalıb-çapan var, nə bir-birilərini aldadan, nə mal dövlət, nə pul yığan, nə işə gedən, nə də işdən gələn. Hər kəs oturub daxmasında axirət gününü fikirləşir. Onsuz da dünyanın malı dünyada qalacaq deyib, öləcəyi günü gözləyirlər.

Peyğəmbər o saat səhvini başa düşür, görür ki, belə getsə yer üzündə insan deyilən məxluq qalmayacaq. Yenidən əllərini göyə açıb, Allah taalanı səsləyir ki, ya Allah özün bilən yaxşıdı, canım sənə qurban olsun, keç günahımdan, səhv eləmişəm, belə getsə insanların kökü kəsiləcək, qaytar şeytanı insanların beyninə.

Deyir, Allah taala təzədən şeytanı insanların beyninə qaytarır və insanlar yenidən başlayırlar beyinlərindəki şeytanın hökmü ilə dünyanın malına tamah eyləyib, qanlar tökməyə, müharibələr etməyə, var-dövlət yığmağa, bacardıqca bir-birlərini aldatmağa... indi o təəccüblə fikirləşirdi ki, görəsən ola bilərmi ki, Allah taala onu işıqlı dünyaya xəlq edəndə beyninə şeytan qoymağı yadından çıxartsın, əgər yadından çıxartmamışdısa, bəs niyə o da şeytanın əməli ilə dünyanın malına uyuyub, onu əhatə eliyən camaat qoşula bilmir?!

Beynində fırlanan bu sualın cavabı onun sifətinə yayılmış təbəssümlə yaşarmış gözlərində əks olunmuşdu, gözlərini, sifətindəki təbəssümü isə nə onun özü görüb oxuya bilirdi, nə də başının üstündə yarpaqlarını xışıldada-xışıldada, ağrın-ağrın yırğalanan dilsiz-ağızsız ağaclar.

***

...Gün fırlanıb axşam olacaqdı, gecə gələcəkdi, qolu yenə zoqquldamağa başlayacaqdı, onu yatmağa qoymayacadı və onda yadına düşəcəkdi ki, bu günü də belə bada verdi, yenə də həkimin yanına gedə bilmədi və özünü söyə-söyə təzədən söz verəcəkdi ki, sabah neçə olursa-olsun, həkimin yanına gedəcəm...

*1985-ci il*

*Mən oxuculardan üzr istəyib, "Tənhalıq həsrəti" hekayəmin içində də "film-çəkiliş" kimi verdiyim "Kölgə" adlı hekayəmi, həm də müstəqil hekayə kimi Sizlərə təqdim edirəm.*

## KÖLGƏ
(hekayə)

...Ətrafda nə qədər canlı var idisə, hamısı bir günlük ömürlərini üstlərindən keçirib, üz tutmuşdular gecdənnən hardan çıxmışdılarsa, ora tərəf: mal-qoyun qarınlarını doydurub, təpənin döşü ilə örüşdən qayıdırdı, qazlar, ördəklər qağıldaşa-qağıldaşa çaydan çıxıb, yanlarını basa-basa yiyələrinin qapısına tərəf gedirdilər, yerdə bör-böcək, qarışqalar, göydə quşlar tək-tək gözə dəyirdilər; hamısı yuvalarına çəkilməkdə idilər.

Oğlanla anası da Çınqılın dibindəki tütün şitillərini suvarıb əllərində bel, Ağdaşın altı deyilən təpənin ətəyi ilə tezdən çıxdıqları evlərinə qayıdırdılar.

Oğlana elə gəlirdi ki, təkcə bütün gün ərzində hiss olunmadan gəlib kənddən xeyli aralı sıralanmış dağların üstünə çıxmış günəş dağların arxasında onu

gözləyən qan rəngli gölün ağuşuna girməyə tələsmir: dağların üstündən asılıb, öz yuvalarına çəkilməkdə olan canlılara həsrətlə tamaşa eləyirdi, çünki günəş də bütün canlılar kimi, tezdən hansı yuvadan çıxmışdısa, o tərəfə dönmək istəyirdi, onu qoynuna çəkən qanlı gölün qanına bələnmək istəmirdi.

...Anası beli çiynində aparırdı, oğlan isə, belin sapından yapışıb arxasınca sürüyürdü. Anası bir az irəlidə, oğlan isə, onun böyrü ilə gedirdi. Heç biri dinib danışmırdı. Onların ətəyi ilə getdikləri təpənin kölgəsi uzanıb, özündən beş-altı dəfə uzun olmuşdu; təpədən xeyli aralıda axan çayı keçmişdi, üz tutmuşdu çayın o biri üzündə cərgə ilə düzülmüş evlərin həyətinə sarı. Evlərin aynabəndinin, pəncərələrinin şüşələrində işıqlar oynaşırdı. Kölgə can atırdı ki, o işıqları söndürsün və hər yeri öz kölgəsi altına alsın.

... Oğlan indi də gözlərini günəşdən, dağdan-dərədən yığışdırıb, anasının yol çəkən, hərdən səyriyən gözlərinə, illərin sifətində açdığı cizgilərə zilləmişdi. Anasına tamaşa eləyə-eləyə birdən öz-özünə kəşf etdi ki, insanların özləri kimi, danışıqları, oturub-durmaqları kimi, susmaqları da cürbəcür olurmuş: adam var susanda darıxırsan, ona ürəyində acıyırsan, istəyirsən ki, bir şey danışsın, desin, gülsün. Dinib-danışmayanda fikirləşirsən ki, bu nə qədər əfəl, bivec, heç nəyə yarımayan adamdı. Bir başqası susanda özün bilmirsən neyniyəsən, bilmirsən, böyürlərindən sallanan əllərini

hara dürtəsən, ayaqlarını necə qoyasan, nə haqda, necə danışasan? Birində özündən zəhlən gedir, o birində susandan.

Anasının susması isə bunların heç birinə oxşamırdı. O, anasının böyrüncə gedə-gedə nə darıxmırdı ki, anası niyə dinib-danışmır, nə də əli, ayağı, özlərinə yer axtarmırdılar. Yol çəkən, səyriyən gözlər, illərin sifətində açdığı cizgilər, oğlanın içini "burub" işə salmışdı. Oğlanın içi, beyni qurulu saat kimi işləyirdi. Təbiət öz dilsiz varlığı ilə adamı necə danışdırırdısa, anası da indi öz susmağı ilə oğlunu həmin dildə danışdırırdı. Oğlan fikirləşirdi ki, Allah bilir, anamın indi səyriyən gözlərinin qabağında, dayaz çayın içi ilə ayaqyalın ağzı yuxarı, ağzı aşağı, suyu sıçrada-sıçrada arıq, çəlimsiz qız uşağımı qaçır (anasının danışığından oğlanın beynində anasının uşaqlığı belə qalmışdı və elə bil suyun içi ilə qaçan o qız uşağını nə vaxtsa, onun özü də görmüşdü), çoxdan dünyalarını dəyişmiş ata-anasınımı xatırlayır, uşaqlarına toymu çaldırır?

Anası danışsaydı, oğlanın fikirləşdiyi şeylərdən biri haqqında danışa bilərdi, susmağı ilə isə oğluna yüz şeyi danışdırırdı.

Birdən anası addımlarının ahəngini pozmadan, sifətində dəyişiklik etmədən, gözlərini yoldan yığışdırmadan, oğluna tərəf baxmadan, beynindəki fikrin davamı kimi, dilləndi ki, bu təpəni şahid çəkib sənə bir şey tapşırıram, çalış ona əməl et. Harda olsan, yadın-

dan çıxmasın: Xeyransa xalan öləndən sonra, həmişə ona Quran oxutdur. Xeyransa sonsuzdu, dünyadan iz-siz gedəcək.

Hələ dünyasını dəyişməmiş Xeyransa xalası haqqında deyilən bu sözlər, oğlanın içini göyür-göyür göynətdi və bu göynərtini canından çıxartmaq üçün o, nədənsə başını göyə qaldırıb it kimi ulamaq istədi. Başını yuxarı qaldırdı, amma ulaya bilmədi. İçinin göynərtisi vurub bəbəyini yandıra-yandıra gözlərini yaşla doldurdu, ayağının altını görmədi, səndirlədi, gözlərini yumub açdı. Gözünün içinə yayılmış yaş yığılıb yanağına süzüldü.

Sonrakı sözləri elə bil qeybdən eşidirdi.

... Allah-Təalanın işindən də baş açmaq olmur. O bədbəxt görən, neyniyəcəkdi başdan-ayağa əclaflarla dolu olan bu boyda dünyaya, heç olmasa, özü kimi bir mayıf uşaq gətirməklə? Dünyanın gedişimi dəyişəcəkdi?... Xeyransanın özünü belə yaradajaydısa, neynirdi yaradıf? Bizə göz dağımı eləmək istəyirdi?

...Anası bayaqdan, anadangəlmə topal olan, qıvrıla-qıvrıla, min bir əziyyətlə yeriyən, dünyaya qız gəlib, qız qarıyan, özündən böyük bacısı Xeyransa haqqında fikirləşirmiş. Yol çəkən, səyriyən gözlərinin qabağında nə balaca qız uşağı qaçırmış, nə də oğluna-qızına toy çaldırırmış.

...Oğlana birdən gün kimi o da aydın oldu ki, öz susmağı ilə adama yüz şey danışdıran, darıxmağa qoy-

mayan gözlərin, sifətin yiyəsi ancaq belə şeylər haqqında fikirləşə bilər.

...Kölgə artıq uzanıb şüşələrdə oynaşan işıqları söndürmüşdü, onların varlıqlarından əsər-əlamət qoymamışdı. Və göz işlədikcə hər tərəfi Kölgə öz kölgəsi altına almışdı: günəş kəndin kənarında sıralanmış dağların arxasındakı qan gölünə düşürdü.

...Kölgəsi hər yanı basmış təpənin ətəyi ilə, oğlan anasıyla tütün suvarmaqdan qayıdırdı. Nə oğlan danışırdı, nə anası. Anası beli çiynində aparırdı. Yol çəkən gözləri də yuvasından dikəlib daha tez-tez səyriyirdi, elə bil onu harasa, heç kimin görmədiyi, bilmədiyi, təkcə o bir cüt gözə bəyan olan sehirli bir aləmə tərəf çəkib aparırdı. Anası yüngül addımlarla, nəfəsini belə dərmədən onu sehirli aləmə tərəf çəkib aparan bu bir cüt gözün dalınca gedirdi...

Oğlan isə belin sapından yapışıb dalınca sürüyürdü. Və elə bil oğlan beli sürümürdü, bel onu arxadan itələyə-itələyə anasının ardınca aparırdı...

# TORPAĞIN RUHU

*Oğlum Turala ithaf edirəm.*

Ata!.. Ata!... çığırtısı eşidib yuxudan ayıldı, handan-hana özünə gəldi, arxası üstə çevrildi, əməlli-başlı tərləmişdi. Köynəyinin yaxasını açdı, əlini can köynəyinin altına salıb, sinəsində, qabırğalarının üstündə gəzdirdi, təmiz suyun içində idi. Yazıq uşaq, qorxusundan düm ağ olmuşdu, sir-sifəti göz yaşının içində idi. Uşaq ayıldığını görüb "ata" – dedi, bərk-bərk onu qucaqladı, üstünə sərildi, göz yaşından islanmış üzünü atasının üzünə yapışdırdı, eləcə də qaldı. Atası bütün varlığıyla onun necə tez-tez çırpınan ürəyinin tıppıltısını, hıcqırdıqca bütün bədəninin necə qalxıb endiyini hiss eləyirdi, ağzına onun duzlu, turşməzə göz yaşının dadı hopmuşdu.

Oğlu yavaş-yavaş sakitləşirdi, yuxuya gedirdi, o isə nələrin baş verdiyini xatırlamağa çalışırdı...

...Birdən ayağının altından xoş bir gizilti keçdi və bu gizilti bütün bədəninə yayıldı. Bu giziltinin nə ilə bağlı olduğu hansı möcüzə iləsə, ona o saat əyan oldu; ayaqlarının altı kənddə evlərindən bir xeyli aralı, çay qırağı boyunca uzanan, hələ şumlanmamış, yaz günə-

şinin altında yaxşıca qızmış, yum-yumuşaq tütün yerindəki torpağın varlığını xatırlamışdı; 20-30 il bundan əvvəl uşaq vaxtı, hey belədən-elə, elədən-belə ayaq yalın, yarı çılpaq qaçdığı torpağın varlığını. Tütün yerinin içində, artıq seçilməyən ləklər boyunca tütün kökləri, şaxları olurdu, tütün yığılıb qurtarandan sonra mal-qoyun tütünün şaxlarını yeyirdilər, yemədiklərini ayaqlarının altında əzib xıncım-xıncım eləyirdilər, sonra onlar bütün qış boyu qarın altında qalıb, çürüyürdü, yum-yumuşaq olurdu, və o tütün yeri boyunca qaçanda çalışırdı ki, həmin yum-yumuşaq tütün kökləri, şaxları ayağının altında tez-tez qalsın.

Və o, tütün yerinin içində mal-qoyunun dalınca, uşaqlarla futbol oynayanda rezin topun dalınca, özündən böyük qardaşlarının şəhərdən, dayılarının Rusiyadan gələndə anasına muştuluq xəbərini çatdırmaq üçün o qədər qaçmışdı ki...

...Gözlərini tavana dirəyib, ayaq yaddaşına birdən-birə o günlərin niyə, hardan düşməsi səbəbini başa düşməyə çalışırdı...

...Gördüyü yuxu yavaş-yavaş canlanıb gözlərinin qabağından keçirdi: – Dəyirmançı suyun üstündə, anasını itələyib püştəyə – suya salmışdı, anası suyun içində əl-qol atırdı, çabalayırdı, oğlunu köməyə çağırırdı, sudan çıxmağa çalışırdı. Dəyirmançı isə əlində bel püştənin kənarı boyunca o tərəf bu tərəfə gedə-gedə, anasını sudan çıxmağa qoymurdu. Anası suda axa-axa dəyir-

manın novuna tərəf yaxınlaşırdı. O isə püştənin dibinə dirənən giziltisi bütün bədəni boyunca yayılan həmin tütün yerinin yum-yumuşaq isti torpağının üstü ilə ayaq yalın qaça-qaça qışqırırdı ki, "ay nənə, ay nənə dəyirmançı anamı püştüyə saldı, anam boğulur, ay nənə, qoyma, anam indicə dəyirmanın novuna düşəcək, boğulacaq, ay nənə, qoyma!"

...Yuxuda gördüyü bu hadisəni bir vaxtlar ona anası danışmışdı:

– Tütünü suvarmaq vaxtı imiş, anası gedib su dəyirmanına püştə ilə gedən sudan tütünün içinə bir-iki bellik su açır. Dəyirman başlayır yarmalamağa, dəyirmançı dəyirmanı oğluna tapşırıb, əlində bel, hirsindən bığlarını çiyniyə-çiyniyə püştənin qırağı ilə suyun başlanğıcına doğru gedir və gəlib suyun başında anasıyla rastlaşır.

Dəyirmançı kəndin hörmətli ağsaqqallarından biri idi. Kənd camaatının buğdasını üyüdürdü, gəlinlərin heç biri hörmət əlaməti olaraq onunla danışmırdılar. Səksəndən yuxarı yaşı var idi. Gur səsli, güclü, işgüzar, bir az da hirsli adam imiş.

Anası dəyirmançını görən kimi, başındakı şalın qabağını gözünün üstünə çəkir, ağzına yaşmaq alır, istəyir ki, uzaqlaşsın. Dəyirmançı imkan vermir, onu hirslə itələyib çox da dərin olmayan püştəyə, suyun içinə salır, özü də yuxuda gördüyü kimi püştənin qırağı ilə addımlayır, anasını sudan çıxmağa qoymur, anası

da səsini çıxarmadan (yuxuda isə, anası nədənsə, çığırırdı, onu köməyə çağırırdı) dəyirmanın novuna tərəf axan su ilə getməməyə çalışırmış. Dəyirmançının hirsi soyuyub gedəndən sonra anası bir təhər sudan çıxıb səssiz-səmirsiz suyu süzülə-süzülə gedir evə.

Nənəsi bu hadisəni eşidib bərk hirslənir, anasını danlayıb deyir ki, utanıb yerə girmirsən, dağdan ağır kişinin suyunu kəsirsən, camaatın buğdasını üyütməyə imkan vermirsən..

...O isə, nədənsə, yuxuda nənəsini köməyə çağırırdı.

Yuxuda, uşaqlıqda keçirdiyi o günləri yenidən yaşadığından, on illər bundan əvvəl ayaq yaddaşına hopmuş yum-yumuşaq isti torpağın xoş gizilti hissi oyanıb yenidən onun varlığına hakim kəsilmişdi...

...O yerlər indi işğal altındaydı, onlar üçün ən əl çatmaz, ün yetməz məkana çevrilmişdi. Dünyanın on minlərlə kilometr uzaqlıqda olan hər yerinə, lap kosmosa da getmək mümkün idi, təkcə o doğulduğu, böyüdüyü, uşaqlığını keçirdiyi, doğmadan doğma yerlərə gedib çatmaq mümkünsüz olmuşdu...

...Paltarını geyinib şəhərə çıxmaq istəyirdi, uşaq ağlayıb əl çəkmirdi ki, "ata məni də özünlə apar". Evdəkilər nə qədər çalışsalar da, onu fikrindən döndərə bilmirdilər. Nəalac qalıb, pəncəyini, ayaqqabısını çıxartdı, qalan paltarları əynində, uşağı aparıb yuxuya verib, sonra getmək istədi. Dibdəki yataq otağına keçdi,

oğlunu çarpayıya uzadıb böyründə uzandı və nə vaxt uşağa qoşulub yuxuya getdiyindən xəbəri olmadı... Bir də gördüyü yuxunun təsirindən "ay nənə, qoyma anam boğulur, ay nənə, qoyma, anam boğulur!" qışqırtısına oğlunun oyanıb ağlaya-ağlaya "ata, ata" qışqırdığı səsə oyanmışdı...

...Yenidən yuxuya gedib, sinəsində yatmış oğlunun eyni qaydada, tez-tez döyünən uşaq ürəyinin döyüntüsünü, aramla, dərindən alıb buraxdığı, üzünə yayılan isti nəfəsini, nəfəsdən sifətində əmələ gətirdiyi tər damlalarını öz bədənini hiss edirmiş kimi hiss eliyirdi.

...Birdən ona elə gəldi ki, canındakı o torpağın xoş giziltisi – ruhu onu qucaqlayıb yatmış oğluna da keçdi... Və əminliklə inandı ki, günlərin birində belədən-elə, elədən-elə qaçdığı o torpağın üstündə oğlu da qaçacaq və onun varlığına da bu xoş gizilti hakim kəsiləcək və o nə qədər başını sındırsa da, canındakı hissin ona hardan tanış olduğunu heç cür tapa bilməyəcək.

...Bunun belə olacağına özünü inandırdı, içində bir xoşbəxtlik havası dolaşdı və yenidən oğluna qoşulub dərin yuxuya getdi...

*1989-cu il*

# YOL

– ... Eeeh, gör, neçə illərdi görüşmürük.

– ...Həəə ...aşağı-yuxarı, bir iyirmi-iyirmi beş il olar.

– ...Görürsən, illər necə sürətlə gəlib keçir üstümüzdən.

– ...

– ... Balaca olanda, tez böyümək istəyəndə, böyüklərə həsrətlə baxanda, vaxt elə bil dayanmışdı, günlər, aylar, illər gəlib keçmək bilmirdi.

– ...

– Bilirsən, bu yaxınlarda yadıma nə düşmüşdü?...

– ...?!...

– ...Hardasa, qırx il bundan əvvəl, birinci sinifdən, dördüncü sinfə kimi oxuduğumuz sinif otağımız... Yadındadı, o bapbalaca, lap dibdə, iki cərgə parta zorla yerləşən sinif otağı? ...Biz balacalar o partaların arasıyla sıxılıb birtəhər keçirdik, sinif müəllimimiz rəhmətlik Həsən müəllim isə əllərini partaların kənarına qoyub, özünü yuxarı darta-darta çox çətinliklə, zülmlə keçirdi. Arxa divardakı pəncərə, o biri kəndlərə keçib gedən asfalt yola baxırdı, ara sıra o yolla avtobuslar, yük maşınları, lulkalı motosikletlər, at, digər heyvanlar keçirdi. İkimiz də əlaçı idik, mən qapının ağzındakı cərgədə, birinci partada, sən isə, o biri cərgədə birinci partada otururdun. Həsən müəllimin qabaq stolu sənin oturdu-

ğun partanın qabağına qoyulmuşdu, Həsən müəllimin arxasında, divarın ortasından, qara rəngli lövhə asılmışdı. Həsən müəllim bu lövhədə əlində mel hərfləri, rəqəmləri bir-bir bizə öyrətmişdi... Sinifimizə getmək üçün, iç-içə olan iki sinif otağını keçməli idik. Birinci sinif otağında yuxarı sinifin, o biri sinif otağında isə, hardasa, altıncı, yeddinci sinifin uşaqları oxuyurdular. Yadındadı, dərsə gecikəndə, utandığımızdan o iki sinfi keçib getməzdik, zəngin vurulmasını gözləyərdik...

– ...Hə ...hamısı sən dediyin kimi idi, amma, o bapbalaca, lap dibdə yerləşən sinifimizdən, nədənsə, mənim yadımda daha çox qalan, tez-tez xatırladığım bilirsən, nədi?

– ...?...

– ...Dediyin sinifdə, üçüncü ya dördüncü sinifdə oxuyurduq, nə isə yazı-yazmaqla məşğul idik, yazını yaza-yaza gözümün ucu ilə Həsən müəllimə baxanda, gördüm ki, yaman dərin xəyala dalıb, biz uşaqlara tamaşa eliyir, bir xeyli tamaşa eliyəndən sonra, yüngülvari gülümsündü, başını yellədi, özü-özü ilə danışan kimi pıçıltılı səslə dedi ki, görəsən, 20-30 ildən sonra bu balaca balaları nələr gözləyir, bunların axırı necə olacaq? Sifəti dəyişdi, gözləri yaşardı, başını aşağı dikdi, əlini pencəyinin cibinə salıb dəsmal çıxartdı, gözlərini quruladı. Mən tez baxışımı ondan çəkib, yazımı yazmağa davam etdim... O uzaq illərdə Həsən müəllimin dediyi sözlər, gözlərinin yaşarması fürsət düşən kimi gəlib məni tapır və ürəyim sızıldaya – sızıldaya o illəri yenidən yaşıyıram.

– ...Həəə ...Həsən müəllimin dediyi kimi o illər üstümüzdən bir an kimi keşdi, o bapbalaca biz uşaqlar gəlib çatdıq qocalığın bir addımlığına. Və çatdığımız bu günlərdən baxanda görünən odu ki, sən, pis-yaxşı özünü tapa bildin, işlərini elə qurdun ki, özündən başqa ətrafındakıların əlindən tutursan, onlara həyan olursan. Məndə isə alınmadı, heç kimə köməyim dəymədi... Bir ailəm oldu, bir də mən...

...Bilirsən, ...hərdən fikirləşirəm və heç bir cavab tapa bilmirəm, niyə belə oldu? ...Bəxtim niyə gətirmədi?... Uşaqlıq illərində, axı bizim bir-birimizdən elə bir fərqimiz yox idi. İkimizdə məktəbi əla qiymətlərlə oxuduq, eyni universiteti bitirdik. İndi niyə belə fərqli yerlərə gəlib çatdıq? Bizə qarşı münasibətlər niyə belə fərqli oldu?

– ...?!...

– ...Həəə ...de görüm necə fikirləşirsən, səbəbi nədədi?

– ...Əlbətdə, – bilmirəm, – indi sən soruşursan və mənim ağlıma gəlir ki, ...bəlkə, ...bəlkə səbəbi ondadı ki, mən hələ o bab-balaca dib sinifdə oxuduğumuz illərdən, nədənsə, hardansa, o fikirlərlə yaşayırdım ki, böyüyüm, oxuyum, işləyim insanlara, ətrafımdakılara köməyim, xeyrim dəysin. Həmişə beynimdə bu arzu ilə, bu istəklə yaşamışam... Fikirləş, gör, sən də o uzaq uşaqlıq illərindən bəri o istəklə, o arzularla yaşamısanmı?.. İçində gedib çatmaq istədiyin o Yol olubmu?...

...?!..

*1997-ci il*

## KÖKLƏNMƏ VƏ YA KAİNATLA TƏMASDA

Musiqi alətində hansısa havanı ifa etmək üçün, aləti kökləməlisən, kökləməsən havanı düzgün ifa etmək mümkün olmayacaq. Alət köklənəndən sonra nəzərdə tutulan hava düzgün çalınır, alətdən istədiyin səsləri ala bilirsən. İnsan da belədi: beynindəki fikrə köklənəndə, fikir başlayır addım-addım həyata keçməyə. Fikri beynə oturtmaq, onu beyində yaşatmaq o deməkdi ki, sən artıq o fikrə, o "ideyaya" köklənmisən, sən o kökdəsən.

Mükəmməliyə gedən Yol məhz O daxili köklənmədən keçir.

***

Təbiətdə bizim onları görüb-görməməyimizdən, anlayıb-anlamamağımızdan, kəşf edib-etməməyimizdən asılı olmayaraq hər şey var. İndiyə kimi olanlar hamısı bizim onları dərk edib-etməməyimizdən asılı olmayaraq olub və olacaq. İstər Nyutonun qanunları olsun, istər Enşteynin nisbilik nəzəriyyəsi, istərsədə, Amerikanın kəşfi.

Yəni, Amerika onsuz da yerindəydi, var idi, indi də yerindədi, var! Təbiətin nəyinə lazım, sən onu kəşf etmisən, ya yox! Onu "Amerika" adlandırmısan, ya "Hindistan". Yəni təbiətlə bağlı ən mürəkkəb hesab olunan və ya ən sadə görünən indiyə qədər kəşf olunan və bundan sonra kəşf olunacaq bütün qanunlar bizim ətrafımızdadı – onlar gözlə görünəndi, fəhmlə duyulandı, bircə o qalır ki, sən öz varlığınla (ağlın, ruhun, hissiyyatın, intuisiyan və s.) təbiətlə vəhdət yarada, bir kökə köklənə biləsən. Bu məqamda sən İlahi qüvvənin bir parçası olan təbiətin bir parçasına çevrilirsən, davamı olursan, olanları və olacaqları hiss edirsən, qavrayırsan, təbiətin ötürdüyü informasiyaları almaq, qəbul etmək üçün həmin əlaqə xəttinə qoşulursan. Və məhz bu anda, bu məqamda insanla təbiət arasında gözlə görünməyən qarşılıqlı əlaqə, informasiya mübadiləsi yaranır, başqalarının duya, hiss edə bilmədikləri sənə aydın olmağa başlayır.

...Heyvanlar isə təbiətlə eyni kökə köklənib, ona görə də insanlardan fərqli olaraq zəlzələ, fırtına və s. kimi təbii fəlakətləri qabaqcadan hiss edir, hətta öz dillərində biz insanlara xəbərdarlıq da edirlər. Şüur sahibi olan insanlar isə, öz köklərində olmadığından, bütün bunları hiss edə bilmir. İnsanlar kosmosa peyklər göndərirlər, nə qədər qəbuledicilər, aparatlar və s.-lər istehsal edirlər, amma onlar bu sadalananları və sadalanmayanları dəqiq hiss edə bilmirlər. Ona görə hiss

edə bilmirlər ki, bir var təbiətin ya-ratdığı, bir də var, təbiətin yaratdığının (bu halda, insanın) yaratdığı. Təbiətin yaratdıqları idealdı, bitkindi, insanın yaratdığı isə nə qədər mükəmməl olsa belə təbiətin yaratdıqları ilə müqayisəyə gələ bilməz.

Təsadüfi deyil ki, seçilmişlər də, həqiqəti dərk etmək üçün, təkliyə çəkilirdi, özüylə baş-başa qalırdı, özünə qapanırdı, özünə köklənirdi. Şüur mane olmayandan sonra, necə deyərlər, həqiqətin qapıları onların üzlərinə açılırdı, yəni, onların daxili köklənməsi ilə təbiətin köklənməsi vəhdətdə olarkən həmin o mükəmməl əlaqə yaranırdı.

Bu İlahi köklənmə olanda, sən öz hissiyyatınla, varlığınla dünyanın, kainatın özü boyda olursan. Və bu qədərində olduğundan dünyada olanları, olacaqları görürsən, duyursan, anlayırsan və qavrayırsan. Çünki sən artıq təkcə olanların deyil, həm də olacaqların içindəsən. Necə ki, əlini, ayağını hiss edirsən, bütün dünyanı da eləcə hiss etməyə başlayırsan. Əgər dünənəcən sənin bədəninin, canının, bütün varlığının sərhədləri dırnaqlarına, saçına, dərinə qədər idisə bundan sonra sən dünya, kainat boyda sərhədsizlik, hüdudsuzluq qazanmış olursan. Və bu İlahi məqamlarda sən dəyişiklikləri öz bədənin kimi hiss edirsən, təbiətin səsini eşidirsən, olanların və olacaqların mehləri, dalğaları (informasiyalar) səndən xəbərsiz sənə ötürülür, sənə çatdırılır. Səndə olan informasiyalar da ətrafa göndərilir,

ötürülür, çatdırılır: nə qədər, hansı biçimdə lazımdısa, hara və necə lazımdısa eləcə. Bütün bu ismarıcları təbiət özü tənzimləyir.

Ağıl, şüur olan yerdə tam bağlantı, əlaqə yaratmaq mümkün deyil. Şüur insanı təkcə idarə etmir, idarə edə-edə çaşdırır, ikiləşdirir, İlahi əlaqədən sapdırır. Nəticədə insanın kainatla bağlantısı içindəki xaosda əriyib itir.

...Təbiətdə insandan başqa hər şey öz kökündədi, təbiətdəki bu köklənməni pozan bir varlıq varsa, o da insandı. Bu mənada, bəzi mülahizələr özünü doğruldur. Bəli, ola bilsin ki, insan bu yer üzünə yersiz əlavədi, başqa dünyaların məhsuludu, bu yer üzünə məhz nizamı pozmaq üçün göndərilib.

...Və ya lap əvvəldən hansısa bir qüvvə insanın həyat yolunu, yaşayış tərzini tamam səhv bir istiqamətə yönəldib, onu öz təbiiliyindən çıxarıb. Tarix başqa yolla getsəydi, böyük cəmiyyətlər, dövlətlər qurulmasaydı, dinlər, təriqətlər yaranmasaydı çox güman ki, bu günün insanı da tamam başqa cür olardı. O, təbiətin dilini mükəmməl biləcək, onun bir parçası olacaq, sözün əsl mənasında bu günkü süni, qurama, riyakar cəmiyyətlərin yox, yaranışından milyard illər keçsə belə öz bəkarətini qoruyan kainatın vətəndaşı olacaqdı.

...İnsan dünyaya gələndən şüuru (bəlkə də, şeytan deyilən şey elə şüurdu) formalaşana qədər İlahi köklənmədə olur.

Heyvanlarda bu ilahi köklənmə əvvəldən sona qədər pozulmur. Ona görə də, hər heyvan öz payına düşən "heyvan" ömrünü yaşayır – yəni dovşan dovşan ömrü, pələng pələng ömrü, qarışqa da qarışqa ömrü yaşayır. Hər dünyaya gələn insan isə sırf insan ömrü yaşaya bilmir. Ona şüur hakim kəsiləndən sonra kökü (köklənməsi) davamlı olaraq pozulmağa başlayır. Az sayda insan olur ki, onlar bu prosesdən cüzi fəsadlarla çıxır və çoxluq da onları ya dahi, ya da dəli adlandırır.

Bir qədər də uzağa və dərinə getsək, dünyanın, deməli, o cümlədən bütün kainatın milyard illər boyunca yaşamasının səbəbidə planetlərin bir-biri ilə və ümumilikdə kainatla sabit, pozulmaz bir köklənmədə olmasıdı. Bu köklənmə azacıq belə çat verərsə, bu, əlbəttə ki, son olacaq.

Bəli, şükürlər olsun ki, dünya yaranışından indiyəcən eyni köklənmədədir. Ayrı-ayrı planetlerin özlərində hansısa fəsadlar, hadisələr baş verə bilər, amma planetlərin bir-biriləri arasındakı köklənmə pozula bilməz.

Bizim sakinləri olduğumuz Yer kürəsinin də, bütün kainatla dəyişməz, sabit köklənməsi var. Və Yer kürəsinin özündə – onu təşkil və əhatə edən flora və fauna adlandırdığımız canlılar və cansızlar aləmi arasında da bir köklənmə var.

İnsan həm də yeganə varlıqdı ki, özü ilə təbiət arasındakı köklənməni pozduğu kimi, bir-birləri arasındakı köklənməni də davamlı olaraq pozur və bu uçurum

get-gedə daha da dərinləşir. Bütün bunlar izsiz və təsirsiz ötüşməyəcək.

İnsanlararası köklənmənin pozulması kainatın varlığında insan varlığının nisbəti nə qədərdisə, o nisbətə uyğun olaraq kainatdakı ümumi köklənmənin pozulmasına davamlı şəkildə təsir edir. Və neçə min, bəlkə də milyon illərdən sonra o cüzidən-cüzi təsirlərin kainatdakı ümumi köklənməyə çox əsaslı təsiri olacaq.

Digər canlılara gəlincə, mövcudiyyətlərindən bu günə qədər onların nə hərəkət və instinktlərində, nə də yaşam tərzlərində hansısa bir dəyisiklik baş verib. Və əgər nadir hallarda onlar da nəsə İlahinin yazdıqlarından kənara çıxırsa, bu da insanların günahı ucbatından, onların müdaxiləsi nəticəsində baş verir.

Bəli, insan şüuru bütün canlı və cansız varlıqların ümumi evi olan Yer adlı bu planetə öz yerli-yersiz müdaxilələriylə bədbəxtliklər gətirir. Çayların məcrasının dəyişdirilməsi, meşələrin qırılması, nüvə sınaqları və s. kimi insan əliylə törədilən hadisələr nəticədə təbiətin əks-reaksiyasına, təbii fəlakətlərə yol açmış olur.

***

Məlumdur ki, insan, beyninin imkanlarından hardasa cəmi 5 faiz istifadə edə bilir. Bu rəqəmdən bircə faiz artıq istifadə edəbilənlər isə Napoleon, Enşteyn kimi dahilik zirvəsinə yüksəlirlər. Bir təsəvvür edək

ki, insan bu imkanların hamısından istifadə edə bilir. Onda nələrin baş verə biləcəyini, əlbəttə, dərk etmək mümkün olan məsələ deyil.

Bəli, İlahi varlıq insana sərhədsiz imkanlara malik beyin bəxş edib. İnsan bu imkanlardan istifadə edə bilmirsə, görünür, bunun özünün də hələ ki, bizim o "5 faizlik" beynimizin dərk edə bilmədiyi tutarlı səbəbləri var. Və bu səbəblərdən biri də ola bilsin ki, insanın, insan cəmiyyətinin inkişaf yolunun düzgün olmayan istiqamətə yönəlməsi və ya qəsdən yönəldilməsidi. İnsan o reallıqda yaşamağa məhkum olub ki, beyninin imkanlarını açmaq üçün uyğun şərait olmayıb. Məsələn, necə ki, Azərbaycanda iqlim və şərait münasib olmadığından banan bitmir. Buna uyğun şərait yaradılarsa, əlbəttə ki, burada banan, yaxud ananas yetişdirmək problem olmaz.

Milyardlarla sərmayələr yatırılır, Yerdən kosmosacan pullar səpələnir ki, təbiətdə baş verə biləcək kataklizmlərdən öncədən xəbər tuta bilək, bu məqsədlə peyklər, aparatlar istehsal olunur, amma hətta ən ultra müasir texnika belə təbiətlə bağlı informasiyanı adicə bir siçan qədər tam, düzgün ötürə bilmir. Deməli, Yerdən kosmosacan səpələnən o pullar tam məqsədəuyğun xərclənmir.

Bəlkə də bu sərmayə İlahi qüvvənin yaratdığının (insan) yaratdığına (dəzgaha) yox, özünə qoyulsa insanın beyninin imkanlarının açılması istiqamətində ciddi

işlər görülsə, bu sahəylə bağlı qapalı və ya açıq müəssisələr, elmi institutlar, laboratoriyalar yaradılsa insanın gücü kənarında olanları, mümkünsüz görünənləri reallaşdırmaq mümkün olar.

Bəli, təəssüflər olsun ki, başı milyon kilometrlərlə uzaqlara qarışan insan özünü tamam unudub.... Həmin İlahi qapının açarı isə insan varlığının düzgün köklənməsindən keçir.

*"525-ci qəzet",*
*14.12.2013*

## HƏQİQƏTƏ APARAN YOL

Niyə ilk Konstitusiya 1787-ci ildə məhz Amerikada yarandı – dövlətçilik tarixləri min illərlə ölçülən qosqoca İran,Çin, Hindistan kimi, Osmanlı imperiyası, Yunanıstan, Misir, İtaliya və s. kimi ölkələr dura-dura? Konstitusiya niyə bu dövlətlərdə (əlbəttə, onlarda da dövləti idarə etmək üçün, müəyyən əmrlər, fərmanlar olurdu) deyil, əsasən İngiltərədən, Avropanın digər ölkələrindən axışıb gələn insan toplusunun formalaşdırdığı, təzəcə yaranmaqda olan cavan Amerikada yarandı?

Səbəb budur ki, neçə min illik tarixi olan ölkələrdə, həmin dövr ərzində bu dövləti təmsil edən əhalinin mükəmməl adət-ənənələri formalaşmışdı. Və həmin dövləti, cəmiyyətləri şahlarla, fironlarla, sultanlarla birlikdə, həm də tarix boyunca süzülüb gəlmiş adət-ənənələr idarə edirdi. İnsanlar arasındakı hardasa "idarə olunan" münasibət həm də cəmiyyəti tənzimləyirdi, gözəgörünməz bir nizama kökləyirdi. Adlarını sadaladığımız və sadalamadığımız dövlətlərin hər birində özünəməxsus yazılmamış qayda-qanunlar, təkmilləşmiş adət-ənənələr var idi. Bu qanunlar neçə min

illər idi ki, şəraitə uyğun olaraq, cüzi dəyişikliklərlə nəsildən-nəslə keçə-keçə gəlirdi.

Amerikaya toplaşanlar isə hərəsi bir tərəfdən gəlmişdi və gələnlərin hər biri özü ilə atüstü adət gətirmişdi. Amerikanın özünün isə hələ heç bir köklü adət-ənənəsi yox idi (yerli hindular bu qurama cəmiyyətdən təcrid olunmuşdular). Cəmiyyəti, insanlar arasındakı münasibətləri nizamlayan, oturuşmuş adət-ənənə olmadığından gəlmə əhali biri-birinə qənim kəsilmişdi. Cəmiyyəti sözün əsl mənasında cəngəllik qanunlarıyla idarə olunurdu. Bütün bunlara son qoymaq, insanlar arasındakı münasibətləri, cəmiyyəti, dövləti nizamlamaq üçün tarixdə ilk dəfə "yazılı" adət-ənənə – Konstitusiya yarandı. Aydın görünürdü ki, belə bir qanunlar diktaturası yaranmazsa, qurulmaqda olan ölkə məhvə məhkumdu. Necə ki, hətta günü bu gün həbsxanalarda münasibətləri nizamlamaq üçün "Oğru qanunları" formalaşıb.

Min illərin sınağından, süzgəcindən keçib-gələn adət-ənənələr əslində, insanın özünü, insanlar arasındakı münasibətləri daha yaxşı kökləyirdi. Bu, daha çevik, daha mükəmməl, daha yayğın, öz-özünə təbliğ olunan bir vasitə idi.

Amerika isə özü yaratdığı süni adət ənənəsi – Konstitusiyası ilə, digər dövlətlərdə min illərlə formalaşmış adət-ənənələri demək olar ki, dağıtmağa başladı. Cəhd

göstərdi ki, bütün digər dövlətlərdə də münasibətlər sırf Konstitusiya üzərində formalaşsın. Konstitusiya isə insan həyatını tam deyil, yalnız fiziki (maddi) hissəsini əhatə edirdi. Mənəvi tərəflərə toxunulmurdu.

İnsanın varlığı isə iki hissədən – fiziki (maddi) və mənəvi (ruhsal) hissədən ibarətdir. Ona görə də, insanlara daha doğru, düzgün təsir etmək, özlərinin də ürəyincə olan formada onları idarə etmək, ideala yaxın cəmiyyət formalaşdırmaq üçün insan varlığını təşkil edən həm fiziki (maddi), həm də mənəvi (ruhsal) qatları nəzərə almaq lazım idi. Bunlardan hansısa biri nəzərə alınmayanda yarımçıq yanaşma, yəni, cəmiyyətin köklənməsi birtərfli olur. Cəmiyyətin qanunları insanın varlığını təşkil edən mənəvi (ruhsal) və fiziki (maddi) köklənməni pozulmadan daima saxlamağa xidmət edən bir istiqamətdə olmalıdı.

Amerika Birləşmiş Ştatları və sonralar Avropa ölkələri cəmiyyətin köklənməsini adət-ənənələrlə deyil, qəbul olunmuş Konstitusiya vasitəsi ilə həyata keçirməyə başladı və hardasa, cəmiyyəti də buna kökləyə bildi. Onların müəyyən uğurları cəmiyyətin birtərəfli olsa da kökünün (köklənməsinin) təsiri ilə bağlı idi. O ölkələrdə tərəqqi və inkişaf kimi qəbul etdiyimiz sirrin kökü məhz bundadı. Bu səbəbdən Amerika tarix üçün çox qısa bir vaxt ərzində dünyanın ən inkişaf etmiş döv-

lətinə çevrildi. Bəlli bir zamanda bütün dünyanın ümumi daxili məhsulunun, hardasa 80 faizi Amerikada cəmləşdi.

Amma Amerikada, sonralar Avropada mənəvi (ruhsal) köklənməyə fikir verilmədiyindən, ailə münasibətlərində ənənələr davamlı olaraq dağıldığından tənəzzül başlandı. Müqayisə edək: həmin ölkələrdə 70-80 il qabaq kişi və qadınların neçə faizi ailə sahibi idi, indi həmin dövlətin kişi və qadınlarının neçə faizi ailəlidi? Demoqrafik vəziyyət necədi? O zaman ailədə uşaqların sayı nə qədər idi, indi ailədə uşaqların sayı nə qədərdi?

Bəli, görəcəyik ki, çox güclü tənəzzül var. İqtisadiyyatda artım varsa, deməli, bu sahədə işlər, hardasa düzgün qurulub. Demoqrafik vəziyyətlə bağlı ailələrin sayı, uşaqların sayı azalırsa, az nisbətdə qurulan ailələrdə də boşanmalar çoxdusa, əlahəzrət fakt deyir ki, bu istiqamətdə münasibətlər düzgün qurulmayıb, düzgün köklənməyib. Bu ölkələrdə əhalinin sayı, əsasən, mühacirlərin hesabına artır. Bu artımlar olmasa, həmin dövlətlərdə çox ciddi problemlər yaşanar.

Bütün bunlar Amerika və Avropa dövlətləri üçün çox ciddi fəsadlar törədir. Ona görə də, o dövlətlərin sonu qaranlıq görünür, belə ki, bu süni inkişafın sonu yoxdu. Çünki mənəvi (ruhsal) və maddi (fiziki) köklənmələr bir-birini tamamlamalı, biri o birinin hesabına olmamalıdı.

SSRİ-də Stalin dövründə "xalqların rəhbəri" şəxsi keyfiyyətləri hesabına cəmiyyəti kommunizm adlanan ideologiyaya kökləyə bilmişdi. Bu köklənmə enerjisi həm də SSRİ-də istehsalatın, hərbi sənayenin və digər sahələrin inkişafına yönəldilmişdi. Odur ki, bu sahələrdə qısa müddət ərzində çox böyük uğurlar əldə olunmuşdu.

Stalinin vəfatından sonra, cəmiyyət alışdığı bu köklənmədən çıxdı və bunun əvəzedicisi olmadı. Bu cəbəbdən SSRİ kimi qüdrətli hesab olunan dövlət zəifləyə-zəifləyə nəticədə çökdü.

...Hitlerin idarə etdiyi alman cəmiyyətində də düzgün istiqamətə olmasa belə, müəyyən köklənmə var idi. Hitler şəxsi keyfiyyətləri – idarəçilik, natiqlik və s. qabiliyyətləri hesabına əhalini milliyyətçi sosial ideologiyaya kökləyə bildi. Amma əlbəttə, tiranların şəxsi keyfiyyətlərinə hesablanan cəmiyyət normal axarla davam edə bilməzdi ki, tarix də bunu təsdiq etdi.

Bu mənada, sırf yazılmış qanunlar üzərində köklənən cəmiyyət də sağlam ola bilməz. Məsələn, Amerikada bir neçə il bundan əvvəl "Uraqan" adlı təbii fəlakət baş verəndə, dağıdıcı qasırğalar Nyu-Orleanı suya qərq edəndə bütün sahələr kimi hüquq-mühafizə sistemi də iflic vəziyyətə düşdü. O sistemdə çalışanlar öz başlarının hayına qalanda, yazılmış qanunlarla qurulan köklənmə sistemi çat verəndə cəmiyyətin öz içində

mənəvi (ruhsal) köklənmə olmadığından insanlar vahimə içində qaldlar. Bölgədə əsl kriminogen vəziyyət yarandı, aləm bir-birinə qarışdı – mənzillər, mağazalar qarət olunurdu, insanlar bir tikə çörək üçün bir-birlərini öldürməkdən belə çəkinmirdi.

Belə misalları çox gətirmək olar. Təsəvvür edin ki, Amerikada, Avropada ciddi bir hadisə baş versə, Nyu-Orlean misalındakı kimi qısa deyil, daha uzun müddətdə yazılmış qanunlar işləməsə, cəmiyyətin, dövlətin fiziki (maddi) köklənməsi pozulsa, həmin dövlətdə yaşayan insanlar, heç bir kənar qüvvə olmadan, elə özləri özlərini məhv etməyə hazır olan böyük insan kütlələrinə çevrilərlər.

Digər bir nümunə. 1988-ci ildə Qərbi Azərbaycandan böyük insan kütlələri didərgin düşdü. Bütün dövlət qurumları iflic vəziyyətdə idi. Heç bir yazılmış qanun işləmirdi, insanlar dağlara, dərələrə səpələnmişdi. Amma bütün bunlara baxmayaraq onların aralarında heç bir kriminogen hadisə qeydə alınmadı. Əksinə, insanlar əvvəllər tanımadıqları yaşlıların, uşaqların, qız-gəlinlərin yolunda həyatlarını risqə qoyurdular və yeri gələndə, həyatlarını qurban verənlər belə var idi. Bu, Qarabağdan köçkün düşən azərbaycanlıların timsalında da təsdiqini tapdı. Çünki onlar min illərdən gələn yazılmamış qanunların, adət-ənənələrin yaşadığı mühitdə göz açıb böyümüşdülər, o mühitə köklənmiş insanlar idi. Onla-

rın fiziki köklənməsi pozulsa da, mənəvi (ruhsal) köklənmə hələ diriydi, işləyirdi.

Bəli, mənəvi (ruhsal) köklənmə dağıldıqdan sonra, onu yenidən bərpa etmək, yenidən kökləmək mümkünsüz görünür. İtirilmiş fiziki (maddi) köklənməni isə zamanla bərpa etmək mümkündür.

Federiko Fellinin "Orkestrin repetisiyası" adlı filmində hadisələr əvvəldən axıra qədər bir məbəddə cərəyan edir. Dirijor hansısa əsəri ifa etmək üçün, hardasa, 35-40 nəfərlik orkestrlə məşq edir. Nəticə heç cür hasil olunmur. Çılğın dirijor ayrı-ayrı musiqi alətlərində ifa edən 35-40 nəfəri heç cür öz sözləri, hərəkətləri, dirijor çubuğu ilə bir kökə kökləyib əsəri ifa etdirə bilmir. Dirijorun səyləri ilə bir neçə dəqiqəliyinə köklənib əsərdən bir hissə çalırlar, sonra yenidən kökdən düşürlər. Dirijor nə qədər özundən çıxır, qışqırır, fasilələr verir, yenidən yığışırlar, heç nə alınmır ki, alınmır.

Orkestrin üzvləri ayrı-ayrı ideyalara mənsub adamlardı – məbədin divarlarına fərqli-fərqli şüarlar yazıblar, tez-tez ara qarışır, stulların üstünə çıxıb hərəsi bir şüar qışqırır, dava-dalaşa, əlbəyaxaya çıxırlar. Aralarında sakit, heç nəyə qarışımayan, bitərəf yaşlı kişilər, qadınlar da var. Onlar ara qarışanda sakitcə termoslardan özlərinə çay süzüb içirlər. Hətta o qarmaqarışıqlıqda piano altına girib məhəbbətlə məşğul olanlar

da var. Bir sözlə, Fellini Yer kürəsində yaşayan bütün insan tiplərini bir məbədin içinə toplayıb.

Dirijor film boyu o mənəvi (ruhsal) köklənmələri dağılmış insanları bir kökə gətirib, musiqi əsərini ifa etdirə bilmir. Və sonda ...bütün bunların cavabı olaraq, böyük bir qüvvə; zəncirdən asılmış böyük kürə şəkilli ağır əşya yellənərək məbədi dağıdır və orkestrin üzvləri dağıntılar altında qalırlar.

Dahi Fellini, dahiyanəliklə bədii formada biz insanlara, bütün dünyaya çatdırır ki, insanların mənəvi (ruhsal) köklənməsini dağıtmaqla məşğul olmayın. Bu, çox ağır nəticələrə, hətta dünyanın sonuna gətirib çıxara bilər.

...Cəmiyyətdə köklənmənin olması – fərq etməz, istər bu köklənmə dövlət üçün xeyirli istiqamətə yönəlsin, istərsə xeyirsiz, dağıdıcı istiqamətə, istənilən halda bu köklənmənin hesabına çox böyük enerji yaranır – qurucu, ya da dağıdıcı enerji.

Köklənməsi olmayan cəmiyyət isə, ətalət basmış, daxili enerjisi olmayan cəmiyyətdi.

Və bu gün televiziyanın, mətbuatın, internetin, sosial şəbəkələrin ağlasığmaz əlaqələndirici imkanları olduğu bir dövrdə, əslində cəmiyyətləri, dövlətləri ümumiyyətlə, bütün dünyanı hansısa istiqamətə kökləmək daha asan, daha əlçatandı. Bircə lazımdı ki, istiqamət

düzgün seçilsin. Köklənmədə həm mənəvi (ruhsal) həm də fiziki (maddi) qatlar nəzərə alınsın.

Mənəvi (ruhsal) və fiziki (maddi) köklənmənin vəhdətində yaşayan insan ən xoşbəxt, ən güclü insandı, ailə ən xoşbəxt, ən möhkəm ailədi, cəmiyyət ən mükəmməl, ən xoşbəxt, ən güclü cəmiyyətdi, dövlət ən qüdrətli dövlətdi.

*"525-ci qəzet",*
*03.12.2013*

Mən bu yazını 1989-cu ildə Ramiz Rövşənin "Göy üzü daş saxlamaz" kitabını oxuyandan sonra, təsirlənib yazmışdım. Onda, Ramiz Rövşən Cəfər Cabbarlı adına "Azərbaycanfilm" kinostudiyasında baş redaktor işləyirdi, yazını apardım Ramiz müəllimə verdim dedim ki, sizin yaradıcılığınızla bağlı yazı yazmışam. Yazını Ramiz Rövşən götürdü. Sonra onunla əlaqəmiz olmadı. Üstündən 30 ilə yaxın vaxt keçəndən sonra, Ramiz Rövşənin qardaşı, istedadlı yazıçı Yaşarın vasitəsi ilə Ramiz Rövşənlə tanış olanda dedim ki, mən hələ 1989-90-cı illərdə Sizin yaradıcılığınızla bağlı yazı yazmışdım və o yazını sizə vermişdim. Ramiz müəllim dedi ki, bu yaxınlarda arxivimi səliqə-səhmana salırdım həmin yazını gördüm, yenidən oxudum.

Azərbaycanımızın dünya səviyyəli şairi Ramiz Rövşəni "Xalq şairi" adı ilə təltif olunması münasibətilə təbrik edirəm və 30 il bundan əvvəl (indi çətin ki, o risqi üstümə götürərəm) qələmə aldığım yazını çapa təqdim edirəm.

*28.05.2019*

# VƏTƏN İSTEDADLI ÖVLADLARI İLƏ TANINIR VƏ YA DÜNYANIN TFU ÜZÜNƏ

Ramiz Rövşənin şeirləri haqqında yazmaq yox, gərək onları tənhalaşıb şərab kimi içəsən, "içdiklərinin" təsirindən sərxoş olub, başlayasan onun şeirlərini sayaqlamağa.

*...Bir dəfə də gəlmişəmmi?*
*Gəlmişəmmi, görmüşəmmi?*
*Yaşamışam, ölmüşəmmi –*
*Dünya mənə tanış gəlir.*

Biz Ramizin şeirlərinin qüvəssi ilə sərxoş olub daha çox özümüz olan dünyaya düşüb o şeirləri "sayaqlayırıqsa", Ramiz Rövşən bu dünyaya baxtına, qismətinə düşmüş istedadının, dünya duyumunun təsiri ilə öz-özünə düşür və həmin dünyadan bu yazıları sanki bizə "sayaqlayır".

"Sayıqlamalar", birinci "ələ" ən yaxın olan yarananlardı. Bunu yaradanlar vasitəçi olurlar, vasitəçi olmaq onların, özlərindən asılı olmayaraq qismətinə düşəndi, seçilmişlərdi.

*Canımda sözlər sıxılır,*
*Artır, üst-üstə yığılır,*
*Yüz nəğmə batır, boğulur,*
*Bir nəğmə qırağa çıxır.*

Birinci "əl", təbiətin, Tanrının yaratdıqlarıdı. İnsanların yaratdıqları ikinci "əldi". Ramiz Rövşənin elə şeirləri var ki, oxuyursan, elə bilirsən buna insan əli dəymiyib, insan beyninin məhsulu deyil. Bu şeirlər sanki, əsən yellə gəlib, yağan yağışla yerə enib və ya yerdən bitib. Ramiz vasitəçilik eliyir, onları yığıb bizimlə paylaşır, hələ göndərilənlərin yüzdə birini bizə çatdıra bilmir.

*İçimin-çölümün yuyulur pası,*
*sətirlər göyərir bu ağ varağda*
*Nə çoxmuş ürəklə əlin arası*
*nə yaxşı, ölmədim bu aralıqda.*

*Sözlər ürəyimdən əlimə yetdi,*
*Bir azca soluxdu-soldu, nə olar.*
*Bir azca şaxlığı-şuxluğu itdi*
*Heç kəs qınamasın, yoldu nə olar.*

Ramiz öz şeirlərinə, öz varlığındakı ruhu keçirə bilir. Ramizin varlığının köklənməsi ilə, şeirinin havası, köklənməsi üst-üstə düşür, həmin köklənmənin davamı olur. Onun şeirləri, onun ruhunun paylanmasıdı, davamıdı, ruh deyilən görünməz halı, şeirə keçirə bilir, şeirə ruh verir, onu canlı eliyir. Şeirlərin bütöv köklənməsi var, ruhu var. Gözünü o sətirlərin üstündə gəzdirən kimi, o şeirlərin havası sənə keçir, o şeirlər vasitəsi ilə sən özünü daha çox dərk eliyirsən. O şeirlərlə

birlikdə daha çox özün, özün olursan. Məhz Ramizin şeirləri özünü, özünə daha çox tanıtdığı üçün sən Ramiz Rövşənin şeirlərini sevirsən, onları dönə-dönə oxuyursan.

*Bunun dağı-daşı tanış,*
*Bunun yayı-qışı tanış,*
*Gözlərimin yaşı tanış,*
*Dünya mənə tanış gəlir.*

Bu cür adamlara, vergili adamlar, işıqlı adamlar deyiblər. Hətta havalı adam da deyiblər. Sən o vergini, işığı, havanı varlığında idarə edə bilməsən, canından azad edə bilməsən. Səni havalandırar, dəli eliyər. Ramiz bunları tutub, dərib, elə öz varlığının kökündə saxlıya bilib bizlərə çatdıra bilir. Bu halını sözə hopdurub, yanğını canından çıxarır.

*İşıqlandım, işıqlandım,*
*Kiməm, bilmirəm daha.*
*İşıqlandım, işıqlandım,*
*Baxın, görünmürəm daha...*

və ya

*Gedirəm, izim böyüyür,*
*Susuram, sözüm böyüyür,*
*Baxıram, gözüm böyüyür,*
*Dünya mənə tanış gəlir.*

Necə fikirləşirsiniz, “ağıllı” baş yiyəsi, məsələn, aşağıdakı sətirləri deyə bilərmi?

*Bu dünya özü də bir ətcə quşdu,*
*körpəcə, yumruca quşdu bu dünya.*
*Arvadlı-kişili, itli-pişikli*
*bir gün görəcəksən uçdu bu dünya.*

və ya

*Kim bu yurda qəm daşıdı?!*
*Bu dağ deyil, baş daşıdı,*
*Bu göl deyil, göz yaşıdı,*
*Bəs bunun gölləri hanı?!*

Ramiz baxtına, qismətinə düşənlə barışıb, ona sevinəndi.

*Nə yaxşı, tapdım özümü,*
*Böyrümdən keçib getmədim.*

...Ramiz bəlkə də, özündən asılı olmayaraq, şeirlərində çoxlu atalar sözləri yaradıb. “Öpüş qayıtmaz yanaqdan, söz qulaqdan dönən deyil”, “Ömür bir bulanıq suymuş deməli, ömür azaldıqca durulur adam”, “Dünyayla dalaşmaq asanmış demə, çətinmi dünyayla barışmaq imiş”, “Bildim ki, dünyanın mənə yox borcu, mən nə birinciyəm, nə də sonuncu”, “Üzməyi öyrənmək gecdi, yol dənizə dirənəndə” və s.

...Ramiz Rövşən cümlələri, Ramiz Rövşən söz düzümü, söz tutumu var: "Dünya mənə tanış gəlir", "Burax gedim ay işığı", "Öldür məni, oynamaram bu tayda", "Ürəyim qaşınar qəmdən", "qəbrim damır ağlama", "nə çəkirsə başım çəkir, bəs niyə qorxur ayağım?", "qəbrim də yoxdu ki, deyəm; üstünə bir gül dər apar" və s. və i.a.

Ramiz bu cür deyimlərlə, sanki, dünyanı ələ salır, dünyaya yuxarıdan, aşağı baxır, lap belə dünyanın üzünə, gözlərinin içinə tüpürür (Ramiz özü də şeirlərinin birində deyir: "Dünyanın tfu üzünə"), o mənada ki, ölümü barmağına dolayır, yoxsa, dünya ilə barışan adam belə kəlmələr deyə bilməz. Ramiz dünyanı, hamıya göründüyü kimi görmür. Bu boyda dünyanı, öz dünyasına tabe eliyir, dünyanı öz dünyasının gözündən necə görürsə, o cür qələmə alır, onun qafiyələri harda eşidilsə, dilə gəlsə qışqırışırlar ki, biz Ramiz Rövşəninkiləriyik. Bunlar Ramiz Rövşən duyumundan gələn tökmə qafiyələrdi

*gecə gen dünya mənə <u>darıydı</u>*
*Ürəyim sinəmi sancan <u>arıydı</u>*

və ya

*Sevincdən*
*<u>ürəyi</u> atdana-atdana,*
*Kürəyində*
*<u>hörüyü</u> atdana-atdana*
*qaçdı Sona, nə qaçdı!*

və ya

*Kiridim, tamam kiridim*
*Bu qıfılım, bu kilidim*
*Örtüldüm qapı kimi.*

Gözləmədiyin fikir kələfinin icindən, birdən gözünü acırsan ki, vərəqin üstünə belə qafiyələr tökülüb. Belə baxırsan sözlər də tamam bir-birinə mənaca uzaq olan sözlərdi: "ürəyi" – "hörüyü", "kiridim" – "kilidim" və s. Bir-birinə mənaca uzaq olan sözlər, cözələnən fikirdə, həm fikri tamamlayır, həm də belə qafiyələr əmələ gətirirlər.

...Demək olar ki, hər bir kişinin yeddi qatına işləyən deyimləri var Ramiz Rövşənin:

*Dişlərinin arasından ah çəkər,*
*ah çəkib yerinə girər gecələr.*
*Hərdən yuxusunda şaqqanaq çəkər,*
*hərdən yuxusunda gülər gecələr.*

*Diksinib yuxudan qalxar arvadı,*
*elə güldükcə qorxar arvadı,,*
*oyadar,*
*oyadar,*
*oyada bilməz,*
*Axırda hönkürüb ağlar arvadı.*

*Ağlamaq səsinə açar gözünü,*
*O yana-bu yana baxar bu kişi.*
*Özü də diksinər öz gülüşündən,*
*dişini-dişinə sıxar bu kişi.*

və ya

*Bu dünyada*
*bəlkə sənə ən çox ağlayan*
*Ən çox ağlatdığın qadın olacaq.*

...Ramizin bəzi sətirlərini xırdalayıb, həmin sətirlərlə bağlı kitablar yazmaq olar:

*Oğulları dava uddu*
*Nəvələri şəhər aldı.*

Davanın oğulları udması aydındı; dava elə bundan ötürüdü. Şəhərlərin oğulları, nəvələri əldən alması, udması, heç də davadan geri qalmır. Şəhər təkcə onların özlərini udmur onların özləri ilə birlikdə, neçə min illərdən bəri aşıb gələn mədəniyyəti, adət-ənənələri də üstündə qırıb, udur. Şəhərə gələn çox vaxt kökündən qopur.

...Ramizin aşağıdakı sətirlərini ən yaxşı yazılmış, çəkilmiş əsərlərin hamısına epiqraf kimi vermək olar:

*İçimin-çölümün yuyulur pası,*
*sətirlər göyərir bu ağ varaqda.*

*Nə çoxmuş ürəklə əlin arası*
*nə yaxşı, ölmədim bu aralıqda.*

*Sözlər ürəyimdən əlimə yetdi,*
*Bir azca soluxdu-soldu, nə olar.*
*Bir azca şaxlığı-şuxluğu itdi*
*Heç kəs qınamasın, yoldu nə olar.*

...Ramizin şeirlərinin bəzilərini, necə deyərlər, böyür başından "didişdirməyə" çalışsam da, onun çox şeirlərinə yaxın düşə bilmədim. "Ay işığı", "Bulud", "Gəmi", "Bir adayam qərib ada", "Başı kəsik gözəl kötük", "Qocalıq", "Yaylığını yel aparır", "Ax, bu qızın barmaqları", "İlan balası", "Qara paltarlı qadın", "Gəlin açın yumruğumu", "Apar", "Bu qışı da saldım yola", "Tək adam" və s. və i.a. şeirləri o qədər bütövdü ki, onlardan ayrıca sətirlər qoparmaq, fikrini həmin sətirlərə söykəmək mümkün deyil. Ramizin şeirləri onları parçalayıb təhlil etmək üçün yazılmayıb, içilmək, canına, varlığına oxuyub hopdurmaq üçün yazılıb.

Və sonda... nə yaxşı ki, təkcə bizim yox, bütün dünyanın şairi olan Ramiz Rövşən Azərbaycanımızın qismətinə düşüb, deməli, Ramiz Rövşən Tanrının istəkli bəndəsi, Azərbaycan isə Tanrının nəzərində olan məkandı.

*1989*

# BİZ DÖVLƏTİN QANUNLARINI TƏBLİĞ ETMƏKLƏ, QANUNLARI DÖVLƏTİN İDEOLOGİYASI SƏVİYYƏSİNƏ QALDIRMALIYIQ

Hansı sahəni götürürüksə, götürək, o sahənin inkişafı üçün, şübhəsiz, çoxlu əsaslar lazımdır. Lakin hər bir sahədə lazımı nəticələri almaq üçün sahənin hökmən aparıcı ana xətti olmalıdır. Bütün yerdə qalanlar ona kömək etməli, yardımçı olmalıdır.

Ana xətt dağılanda, onun əvəzinə yenisi yaranmasa, o sahə gec-tez iflasa uğrayır, gözünün qabağında dağılmağa başlayır. O biri sahələr bu iflasın, dağılma prosesinin qarşısını heç cürə ala bilmir. Dağılma prosesinin qarşısını almaq üçün, hökmən yaranan boşluq yeni aparıcı Ana xətlə əvəz olunmalıdır.

Hər bir dövlətin də siyasətində hiss olunan aparıcı ana xətt – ideologiya olmalıdır. Dövlətin inkişafı onun apardığı ideologiyadan birbaşa asılıdır.

Bu yaxınlara kimi, Azərbaycan SSRİ-nin tərkibinə daxil idi və onda SSRİ deyilən nəhəng dövlətin əsas ideologiyası var idi, bu ideologiya hamıya məlum olduğu kimi kommunist ideologiyası idi. Bütün xarici, daxili siyasətdə, televiziyada, mətbuatda, institutlarda

məktəblərdə hər bir hərəkətın kökü bu ideologiyaya bağlanırdı.

SSRİ dağıldı, Azəbaycan müstəqil dövlət oldu. Kommunist ideologiyasını inkar etdi və neçə ildir ki, Azərbaycanda bir ideologiya boşluğu yarandı.

Televiziyada, mətbuatda, ümumiyyətlə, daxili siyasətimizdə (hələ ki, xarici siyasətimizi hallandırmayaq) bir aparıcı – Ana xətt kimi keçən ideologiya hiss olunmur. Bu aparıcı ideologiya olmasa, dövlətin inkişafı qeyri mümkündür. Hər şey elə qurulmalıdır ki, ölkənin vətəndaşları aparılan ideologoiya ətrafında birləşsinlər.

İndi dövlətin əlində olan televiziya, radio, dövlət qəzetləri nəyi təbliğ edir?

Onlar öz dəsti xəttləri hiss olunmayan (dəsti-xətsizliyin özüdə bir dəstixətdir) iqtidarda olanlara xoş gəlməyə çalışırlar.

Onların istəyinin kökündə “Birinci şəxsə və onun ətrafında olanlara xoş gəlmək” pirinsipi durur. Televiziyanın, mətbuatın, dəsti-xətti, “ideologiyası” dövlət başçısının iş görmə qabiliyyətindən və digər xüsusiyyətlərindən asılı olaraq dəyişir, başçıya uyğunlaşmağa çalışırlar.

Bəs Azərbaycan Respublikasının ideologiyası nə olmalıdır? Hansı ideologiya Azərbaycanın inkişafına güclü təkan verər? Azərbaycan hansı yolla getsə, daha tez Şərqin, dünyanın inkişaf etmiş, öncül dövlətlərindən biri olar?

Mənim bu suallara bir cavabım var: – Biz Azərbaycan Respublikasının Qanunlarının təbliğini dövlət ideologiyası səviyyəsinə qaldırmalıyıq.

Televiziyada, radioda, mətbuatda aparıcı – Ana xətt kimi qanunların təbliği olmalıdır. Belə ki, hər deyilən söz, görülən iş, atılan addım qanuna əsaslanmalıdır. Və əyani göstərilməli, nümayiş olunmalıdır ki, qüvvədə olan qanunlar işləyir, prezidentdən tutmuş ən adi vətəndaşa kimi hər kəs qanuna tabedir. Hər bir Azərbaycan vətəndaşına çatdırmalıyıq ki, onun arxalana biləcəyi bir "Dağ" var. Bu "Dağ" Azərbaycan Respublikasının qanunlarıdır. Qanun hər bir adamın ümid yeri olmalıdır.

Tutaq ki, vergi müfəttişliyində və ayrı sahədə rüşvətin qarşısını almaq lazımdırsa, televiziyada, qəzetlərdə silsilə verlişlər, yazılar vermək lazımdır ki, filan-filan hallarda vergi müfəttişliyi və ya başqa birisi rüşvət ala bilər, qanunu poza bilər, bu boşluqları aradan götürmək lazımdı. Olan qanunları incəlikləri ilə, ardıcıl, qanunu pozanlardan misal gətirməklə başa salmaq, təbliğ etmək lazımdır.

Qanunların mükəmməl olub olmaması, sonrakı işdir. Əgər bu gün hansısa qanunun varsa, o işləməlidir. Mükəmməl qanun deyilsə, calışmaq lazımdır ki, təkmilləşsin və ya yenisi ilə əvəz olunsun. Yoxsa, nə vaxtsa, yazılacaq, qəbul olunacaq qanunları gözləmək olmaz. Ancaq bu gün qüvvədə olan qanunlara əməl edə-edə mükəmməl qanunlar yaratmaq olar. Məsələn, "müəssisələr" haqqında, "müflisləşmə" haqqında və ya başqa qanun qəbul olunur. Amma qəbul olunan qanunlar təbliğ olunmur. Həmin qanunun "Azərbaycan"

qəzetində çap olunması ilə işlər bitmiş hesab olunur. Söz açdığımız “muəssisələr” haqqında qanunun qəbul olunmasında yəqin əsas məqsəd Azərbaycanın, Azərbaycan xalqının mənafeyidir. Belə ki, bu qanunun xeyri o olacaq ki, qanuna əsaslanıb, arxalanıb Azərbaycan vətəndaşları, xarici vətəndaşlar kapital qoyub müəssiəsələr yaradacaqlar və bu müəssiəsələrin yaradılması, işləməsi Azərbaycana, Azərbaycan xalqına xeyir verəcək.

Bilmək lazımdır ki, qəzetdə çap olunan qanunları camaat oxumurlar. Nə buna vaxtları, nə də həvəsləri var. Nə də bunu, açıq deyək ki, hər oxuyan tam dərk eliyə bilmir. Amma televiziyada bu qanunun təbliğinə silsilə verlişlər həsr olunsa, müəssisə yaradanların sayı da artar, işləyən müəssisələrin işində dönüş yaranar, qanunların incəlikləri ilə, çevikliyi ilə tanış olarlar.

Bu yaxınlarda işimlə əlaqədar iki ay Türkiyədə oldum. **Türkiyə ilə Azərbaycanı fərqləndirən əsas cəhət nədir? – sualına mən belə cavab verərdim: Azərbaycandan fərqli olaraq Türkiyədə addımbaşı dövlətin varlığı hiss olunur. Dövlətin varlığı nə deməkdir? – Dövlətin qüvvədə olan qanunlarının işləməsi. Türkiyənin sərhəddinə qədəm qoyanda bunu hiss eliyirsən. Türkiyənin məsələn gömrük işçiləri, yol polisləri, həkimlər, müəllimlər və digərləri qanunlara əməl edirlər. Demək olar ki, rüşvət almırlar, dükanlar, şirkətlər gəlirlərdən vergilərini gizlətmirlər və bütun bunları ona görə etmirlər ki, azərbaycanlı həmkar-**

**larından daha çox vicdanlıdırlar, daha çox vətənpərvərdirlər. Adicə olaraq, ona görə edirlər ki, qanunu pozub, məsələn, rüşvət almaq onlar üçün sərfəli deyil. Qanun pozmağa görə, başqa bir qanunla o, bütün ömrünü, karyerasını puç eliyə bilər. Ona görə heç o haqda fikirləşmirlər, risq edib rüşvət də almırlar. Bizdə isə rüşvət, həm rüşvət verən üçun, həm də alan üçün sərfəlidir.**

Bəli, məhz Dövlət qanunları, dövlətin vətəndaşları üçün yaratdığı şərait, onun vətəndaşlarının daha vicdanlı, daha işlək, daha vətənpərvər eliyir. Onların bacardıqlarını lazımı tərəfə istiqamətləndirir.

Bilməliyik ki, heç vaxt Azərbaycanın 7 milyonluq əhalisini, məsələn prezident nə qədər yaxşı olsa da, onun ətrafında birləşdirmək mümkün deyil. (Heş olmasa yada salaq ki, neçə partiyalar var, müxtəlif cür fikirləşən insanlar var). Amma 7 milyonluq Azərbaycan vətəndaşlarını, onun qanunları ətrafında birləşdirmək olar.

Özü də 7 milyonluq əhalini birləşdirmək üçün onları, çoxları kimi, birliyə çağırmaq lazım deyil. Sadəcə olaraq, Qanunların qarşısında hamının eyni olduğunu əyani şəkildə, hər gün, hər saat, hər dəqiqə sübut etmək lazımdır. O halda çox vaxt keçməyəcək, Azərbaycanımızı irəli aparan işlək Qanunların ətarafında 7 milyonluq Azərbaycan əhalisi bir yumruq kimi birləşəcək.

*"Millət" qəzeti,*
*08.12.1994*

# MÜHARİBƏ – TƏRƏFLƏRİN QƏLƏBƏ QAZANMAQ ÜÇÜN YARATDIQLARI MEXANİZMLƏRİN TOQQUŞMASIDIR

...Müharibəni biz niyə uduzuruq? Bu sualın üstündə prezidentimizdən tutmuş, fəhləmizə, kommersantımıza, ziyalımıza, uşağımıza kimi hamı fikirləşir – baş sındırır.

Bu sualın isə sadədən-sadə bir cavabı var: hazırda müharibə meydanında düşmənlə üz-üzə dayananda biz zəifik. Və ona görə biz daha çox başımızı bu sualın üstündə sındırmalıyıq:

– Axı, biz niyə zəifik?

Bu sualı, müəmmanı başa düşmək üçün müharibənin nə olduğunu özümüz üçün bir daha aydınlaşdıraq: – Müharibə bir-birinə hansı səbəbdənsə, düşmən kəsilmiş tərəflərin qələbə qazanmaq üçün yaratdıqları mexanizmlərin toqquşmasıdır.

Bu mexanizmin detallarına vuruşan əsgərlər də daxildir, tanklar, təyyarələr də, prezidentlər, onların apardıqları siyasət də, ölkələrin sərvətləri də, beynəlxalq təşkilatlar da, qonşu və dünya dövlətləri də, iqlim, relyef də, xalqın psixalogiyası da və s. və i.a. Və ən böyük bədbəxtlik ondadır ki, bu mexanizmin deyək

ki, ayrı-ayrı detallarını götürəndə biz ya qarşı tərəfdən güclüyük, ya da hardasa, onunla bərabər imkanlara malikik. Di gəl, düşmən ayrı-ayrı zəif detallardan elə ardıcıllıqla, elə qabiliyyətlə istifadə edib mexanizm yaradıb ki, bizə qalib gəlir.

Boynumuza almalıyıq ki, bizim zəifliyimiz məhz həmin konstruktor qabiliyyətsizliyimizdədir. Ayrı-ayrı fərdlərin, detalların demək olar ki, günahı yoxdur.

Biz nə daxili imkanlarımızdan, nə də xarici imkanlardan hələ ki, lazımi səviyyədə istifadə edə bilmirik.

Mən bu yazımda daxili vəziyyətdən, daxildə müharibəni udmağa doğru aparan mexanizmin niyə yaranmamasından danışmaq istəyirəm.

Elə hey televiziyada, qəzetlərdə deyirlər ki, Bakıda müharibə hiss olunmur. Bunu deyənlər müharibəyə kommunizm ideologiysı pəncərəsindən yanaşırlar. Kommunizm ideologiyasında da deyilirdi ki, insanın şüurunu o qədər inkişaf elətdirəcəyik ki, hər kəs öz tələbatı ilə razılaşacaq. Neçə illər əszində sübut olundu ki, bu cür ideologiya təbiətin əksinədir, bu yolla nəticəli inkişaf getmir. İnkişaf üçün təbii qanunlara əsaslanan mexnizm olmalıdır.

İndi Bakı camaatı neyləsin? Başdan-ayağa qaramı geyinsin? Ya hərə bir tində oturub aglasınmı? Şeytan həmişə insanın ürəyinə girib onu dünya malına aldadır. İndi Bakıda da hərə öz bacarığı daxilində çörək pulu qazanır, daha çox qazananlar yeyir-içir, biri çağırışdan

gizlənir və hərə öz səviyyəsinə, qabiliyyətinə, dünya baxışına uyğun gününü keçirir.

Bu şeytanı kim qovmalıdır camaatın ürəyindən? Əlbəttə, dövlətin başında oturanların apardığı siyasət, yaratdığı mexanizm.

Gurultulu sözlərdən əl çəkməliyik, təbiətin qanunları ilə razılaşmalıyıq. O televizorda danışanın özü də balasını müharibədən uzaq görmək istəyir. Razılaşmalıyıq ki, bu çox təbii bir şeydir. Hamıını bir arşınla ölçmək olmaz.

...Bu yaxınlarda Böyük Vətən müharibəsinin veteranı olan bir qohum gəlib ki, bəlkə, sənin tanışın ola, bizim gədəni (kiçik oğlunu) müharibəyə çağırıblar, puldan-paradan verib onu birtəhər saxlatdıraq.

Deyirəm ay Bəhram dayı, sən özün beş il başqalarının torpağı uğrunda vuruşmusan, bir belə orden-medal almısan. İndi qoysan, oğlun gedib, öz ana torpağı uğrunda vuruşa.

Qayıtdı ki, bala, o vaxt bizim heç ağlımıza gəlmirdi ki, müharibəyə getməmək olar. Bu haqda demək olar ki, heç kim fikirləşmirdi. Onda təbliğat vasitələri müharibənin qanunlarını bizlərə qəbul elətdirmişdi. İndi isə gözümüzün qabağında, hərənin uşağı bir yolla müharibədən yayınır. İstər-istəməz övladının anasının-bacısının, uşaqlarının dediklərindən sonra fikirləşirsən ki, bu torpaq uğrunda niyə elə mənim uşağım ölməlidir. Qonşuluqda, tanıdığın, bildiyin başqa bir adam pullamı,ya

başqamı bir yolla müharibədən yayınırsa, bu yoluxucu xəstəlik kimi bizlərə – ətrafdakılara yayılır. Gərək bu yoluxucu "xəstəliyin" kökünü kəsə biləsən ki, ətrafa yayılmasın.

...Bəhram dayının dedikləri Böyük Vətən müharibəsi dövründə olub. Böyük Vətən müharibəsindən sonra dünya dəyişib, indi də müharibəni həmin qanunlarlamı aparmaq lazımdır, ya başqa qanunlarlamı? 1941-1945-ci illər müharibəsi ilə indiki müharibənin əsas fərqləri: – Onda müharibəni SSRİ aparırdı, indi SSRİ-nin tərkibindən qopmuş Azərbaycan. Onda sosializm dövründə yaşayırdılar. İndi sosializmdən hansısa başqa cəmiyyətə keçid dövründə. Sosializmdə hər şey (ərzaqdan tutmuş başqa şeylərə kimi) necə deyərlər, dövlətin boynunda idi. İndi isə kommersantlar nəsli yaranır, onlara məxsus müəssisələr yaranıb. Və respublikanın ərzağa və başqa sahələrə tələbatında onların danılmaz rolları var. Elə etmək lazımdır ki, bu strukturlar işləyə bilsin və bəlkə də onların daha çevik, daha səmərəli işləməsi üçün dövlət səviyyəsində şərait yaratmaq lazımdır. Onların müharibəni udmaq üçün daha yaxından necə kömək etmə yollarını öyrənib təhlil etmək lazımdır.

...İndi beynəlxalq aləmdə informasiyanın Azərbaycanın xeyrinə yayılmasından, beynəlxalq ictimai rəyin bizə qarşı münasibətindən çox şey asılıdır. Buna görə kütləvi informasiya vasitələri ilə yanaşı, dünyada keçirilən beynəlxalq idman yarışlarında və başqa tədbirlər-

də öz komandalarımızla iştirak etməyimizlə respublika haqqında fikirlərin formalaşması üçün çox şey edə bilərik.

Respublikada müharibə getməsinə baxmayaraq yəqin ki, mədəniyyət və incəsənət ustaları beynəlxalq aləmdə Azərbaycanı təmsil edib tanıtmalı, respublikamız haqqında fikirlərin formalaşmasında əllərindən gələni etməlidirlər. Biz xalqımıza mənsub olan bütün xüsusiyyətlərdən istifadə etməliyik.

Bütün bunları öyrənən, həmişə analiz edən, dövlətə təkliflər verən yəqin ki, beyin mərkəzləri institutlar lazımdır.

...Və son olaraq bir daha demək istəyirəm ki, biz müharibənin nə olduğunu dərk edib, müharibə mexanizmini işə salmadan, artıq altı ilə yaxın uzanan bizə qarşı ədalətsiz müharibədə qələbə qazana bilməyəcəyik.

*"Millət" qəzeti,*
*11.11.1993*

## AZƏRBAYCANDA ƏHALİNİN 97,9 FAİZİ SİQARET ÇƏKMİR?!

*Respublika Gömruk Komitəsinin rəsmi məlumatından belə çıxır ki, Azərbaycan ən az siqaret çəkmək əmsalına görə, dünyada birincidir.*

**Azərbaycanda xaricdə istehsal olunan siqaret çəkənlərin sayı nə qədərdir?**

Nazirlər kabinetinin 18-19 iyul 1996-cı il tarixli müşavirəsində Respublika Gömrük Komitəsinin verdiyi rəsmi məlumata əsasən, Azərbaycana 4 ay müddətində 1,4 milyon ABŞ dolları həcmində siqaret gətirilib. Rəsmi məlumatlara istinad etsək, belə çıxır ki, hər ay respublikaya 350 min dollarlıq xaricdə istehsal olunan siqaret gəlib. Deməli Azərbaycanda gündə təxminən 11,667 min dollarlıq xaricdə istehsal olunan siqaret satılır.

Azərbaycanda satılan xarici siqaretlərin qiyməti təxminən 1500-6000 manat arasındadır. Bu mənada orta hesabla hər satılan bir qutu siqaretin qiymətini 50 sent (2000 manat) götürək. Onda məlum olur ki, respublikada gün ərzində 23.334 (11,667: 0,5$=23.334) qutu xarici siqaret satılır və ya hər gün 23,334 min qutu xarici siqaret çəkilir. Bu hesabla Azərbaycanda xaricdə is-

tehsal olunan siqaretlər çəkən cəmi 23,334 min (xarici vətəndaşlarla bir yerdə) nəfər var. Nəzərə alsaq ki, ölkə əhalisi təxminən 7,5 milyon nəfərdir, onda belə çıxır ki, əhalinin xaricdə istehsal olunan siqaretlər çəkən hissəsi cəmi 0,3 faiz təşkil edir.

Deməli 7,5 milyonluq əhalinin cəmi 0,3 faizi xarici siqaret çəkir və ya başqa cür desək, Azərbaycan əhalisinin 99,7 faizi xaricdə istehsal olunan siqaret çəkmir.

**Azərbaycanda yerli siqaret çəkənlərin sayı nə qədərdir?**

Mətbuatdan məlum olur ki, ("Ekonomiks" qəzeti, №35, 27.10.1996) Bakı Tütün Kombinatının istehsal gücü 8 milyard ədəd siqaret olduğu halda, indi bu günün cəmi 12 faizindən istifadə olunur. 8 milyardın 12 faizi 960 milyon ədəd siqaret deməkdir. Bəs onda ölkədə bir gündə təqribən neçə ədəd siqaret istehsal olunur? Bu məlumat əsasında aparılan hesablamalara görə, respublikada ayda 80 milyon (gündə isə təqribən 2.700.000) ədəd siqaret istehsal edilir. Bu isə 135.000 qutu siqaret deməkdir.

İstehsal olunan siqaretlərin hamısının satıldığı və siqaret çəkən hər bir nəfərin gündə bir qutu siqaret çəkməsi hesabı ilə belə çıxır ki, Azərbaycanda 135 min nəfər ölkədə istehsal olunan siqaret çəkir. Deməli, 7,5 milyonluq Azərbaycan əhalisinin orta hesabla 1,8 faizi yerli siqaret çəkənlərdir.

*Beləliklə, hesablamalardan məlum olur ki, təxminən 7,5 milyonluq Azərbaycan əhalisinin 1,8 faizi yerli 0,3 faizi xaricdə istehsal olunan siqaret çəkir. Siqaret çəkənlər isə ümumi əhalinin cəmi 2,1 faizini təşkil edir və ya Azərbaycan əhalisinin 97,9 faizi yerli-dibli siqaret çəkmir.*

**Fərq 78,1 milyon ABŞ dolları həcmindədir.**

İndi isə gündə qarşılaşdığımız reallığa əsaslanıb başqa bir hesablama aparaq. Azərbaycanın dediyimiz kimi, təxminən 7,5 milyon əhalisi var. 5 nəfərin bir ailə təşkil etdiyi hesabı ilə Azərbaycanda təxminən 1,5 milyon ailə var. Tutaq ki, 1,5 milyon ailədən 30-40 min (lap 40 min götürək) ailədə, ümumiyyətlə, siqaret çəkən yoxdur. Fərz edək ki, yerdə qalan 1,46 milyon ailənin hər birində bir nəfər siqaret çəkir. Deməli, Azərbaycanda, təqribən 1,46 milyon nəfər siqaret çəkən var. Hər siqaret çəkən gündə bir qutu siqaret çəksə, ölkədə günə 1,46 milyon qutu siqaret çəkirlər. Yuxarıdakı hesablamalara görə 1,46 milyonun 135 mini yerli siqaretlər çəkir. Hər xarici siqaret qutusun qiymətini yuxarıdakı hesabla 50 sentdən götürsək, deməli 1 gündə Azərbaycanda hardasa 662,500 dollarlıq xarici siqaret çəkilir. Deməli bu hesabla hər gün Azərbaycana 662,500 dollarlıq siqaret daxil olmalıdır.

Onda, bu rəqəm ayda təxminən 30x662.500=19,875 milyon dollar təşkil edir. Dörd ayda bu, 79,5 milyon dollar deməkdir. Bu hesabla gömrük komitəsinin verdiyi rəsmi rəqəmlə bizim hesablama apardığımız qeyr-rəs-

mi rəqəm arasında nə az-nə çox, 78,1 milyon dollar fərq alınır.

Maraqlıdır, görəsən, bu qədər pullar hara gedir? Hələ bu təkcə siqaretlə bağlı ortaya çıxan sualdır. Respublikaya o qədər mallar gəlib-gedir ki... Daxildə və xaricdə o qədər əməliyyatlar aparılır ki...

Düşünməyə dəyməzmi, cənablar?!

*“525-ci qəzet”,*
*29.10.1997*

## AZƏRBAYCAN HƏQİQƏTLƏRİ

Azərbaycanda əlbəttə saysız-hesabsız həqiqətlər var. O həqiqətlər ki, onun həqiqət olduğunu subut etməyə ehtiyac yoxdur. Məsələn, Azərbaycanda neft var, pambıq var, ərazisinin 20%-i ermənilər tərəfindən işğal olunub, yeni konstitusiya qəbul olunub, Milli Məclisə seçkilər keçirilib (necə keçirildiyindən söhbət getmir). Bakıda metro var, öz milli pulumuz var – adı manatdır, siyasi partiyalar var, çoxlu qəzetlər çap olunur. Azərbaycanda yaşayan 7 milyon əhalidən biri deyə bilməz ki, deyilənlərin hansısa yalandır.

Daha hansı həqiqətlər var Azərbaycanda? – Azərbaycanda nazirlər var, icra başçıları var, məhkəmələr var, gömrük, vergi işçiləri var, yol polisi işçiləri var və s. və i.a. vəzifə sahibləri var. Bu vəzifə sahiblərinin olması da hamı tərəfindən təsdiq olunan həqiqətlərdir. Və orası da hamı tərəfindən təsdiq olunan həqiqətdir ki, həmin vəzifə sahibləri rüşvət alırlar. Yəni bu fikrin doğruluğunu yoxlamaq üçün şəhərə çıxıb 1000 nəfərdən sorğu-sual keçirmək kifayətdir. Demək olar ki, hamısı təsdiq edəcək ki, bəli alırlar. Onların rüşvət alması Bakıda metronun olması kimi sübuta ehtiyacı olmayan bir həqiqətdir.

Bir də baxırsan ki, böyük bir özəl firmanın sahibi oldu icra başçısı, ya böyük bir dövlət şirkətinin rəhbəri. Özəl firma rəhbəri firmada işləyəndə ayda 5 min 10 min dollar və daha artıq pul qazanırdı. Bütün bu qazancları qoyub gedib olurlar dediyimiz kimi icra başçısı, dövlət şirkətinin rəhbəri. Həmin vəzifələrin maaşı nə qədərdir? Dollarla götürsək 50 dollar ətrafında. Necə olur ki, yəni bu adamlar elə vətənpərvərdirlər ki, o qədər gəlirlərini qoyub başlayırlar 50-60 dollara qulluq etməyə? Hamı bilir ki, yox! Və hamı bilir ki, ümumiyyətlə, vəzifələrə niyə gedirlər.

Günümüzün həqiqətlərinə çevrilmiş rüşvəti niyə alırlar? Əsas sual budur və bu sualın sadədən sadə bir cavabı var: – Azərbaycanda rüşvət almaq üçün gözəl şərait var. Rüşvət almaq sərfəli, gəlirli, demək olar ki, təhlükəsiz bir işdir.

Azərbaycanda indi rüşvət olmasa qeyri təbii olar. İşlədiyin vəzifəyə görə verilən maaşla yaşamaq mümkün deyil. Rüşvət alanda tutulmaq şansı yox dərəcəsində, niyə insanlar ondan istifadə etməsinlər?

Moskvadan Azərbaycana pul verib, mal gətirməyin riski çoxdur, ya icra başçısının kimdənsə rüşvət alıb hansısa qanunlaşdırılan sənədə qol çəkməsi? Əlbəttdə, Moskvadan yox, elə hardan olsa mal gətirmək dəfələrlə artıq risk tələb edir və əzab-əziyyətli işdir. Ona görə də firma rəhbərinin icra başçısı və ya başqa bir yüksək vəzifəyə getməsi çox təbiidir. Azərbaycanda rüşvət alma-

ğın artıq “mədəniyyəti” yaranıb, inkişaf zirvəsinə çatıb; rüşvət almaq, rüşvət vermək “mədəniyyəti”.

Biz hamımız şahidi olduq ki, perestroyka deyilən dövrdə mütəşəkkil cinayətkarlığın yaranması, inkişaf etməsi üçün şərait, mühit yarandı və cinayətkarlıq inkişaf etməyə, kök atmağa, hər sahəyə yayılmağa sərhədlərini genişləndirməyə başladı. Bu şərait Rusiyada daha münbit oldu. Oğrubaşlar, avtoritetlər yaranmağa, məşhurlaşmağa başladı. Camaat arasında onların avtoriteti yüksəlməyə başladı. Onlara həsrətlə baxmağa başladılar; Necə mülklərdə, ofislərdə, xarici maşınlarda, əla geyimlərdə olduqlarını gördülər. Uşaqlar, gənclər artıq onlara bənzəmək istəyirdilər, onların dəstələrinə qoşulurdular. Daha uşaqlar yazıçı, professor olmaq istəmirdilər. Onların nə gündə olduqlarını da görürdülər, cinayət aləminin nümayədələrinin, rüşvət alanların da, necə yaşadıqlarını görürdülər. İnsanlar o vaxt məşğul olduqları işlərdən əl çəkirlər ki, o işlərlə məşğul olmaq, daha onlara sərfəli olmur. Məsələn, Turkiyədə, Avropa ölkələrində rüşvət bizdə olduğu kimi populyar deyil, ona görə ki, rüşvət almamaq daha sərfəlidir. Qazandıqları onlara, ailəsinə, başqa xərclərinə bəs edir. Həmin ölkələrdə şərait elədir ki, dövləti qanunlar idarə edir. Vəzifəyə gələnlər isə öz səlahiyyətləri çərçivəsində qanunların keşiyində dururlar və səlahiyyətlərini aşan kimi qanunun keşiyində duran başqası onu cəzalandırır. Cəza almaq isə karyeranı, həyatını risqə qoymaqdı.

Bizdə isə hələki dövləti qanunlar tam idarə etmir.

Bu yaxınlara kimi, Malakan bağı deyilən yerdə dollar dəyişənlərin əlindən tərpənmək olmurdu, tuturdular, döyürdülər, polislərin sayını artırırdılar xeyri olmurdu.

Ancaq elə ki qanun çıxdı: dollar dəyişənləri neçə dəfə axtarılmış formada cərimə edirlər, cinayət işi qaldırırlar və başladılar qanun tətbiq etməyə, dollar dəyişmə məntəqələri açıldı və Malakan bağı öz-özünə boşaldı.

Başqa bir misal: Bu yaxınlara kimi dükanlara gedirdik bir şey almağa, həm çəkidə, həm pulda bizi aldadırdılar. Respublikada nə qədər dükanlar var idisə hamsı eyni vəziyyətdə idi. Azərbaycanda ticarət sistemində işləyən satıcıların hamısı vicdansız ola bilməzdi. Ticarət sistemi dəyişdi, dükanlar çoxaldı, rəqabət yaranmağa başladı və gördülər ki, pulun qalığını qaytarmamaq, çəkidə aldatmaq onlara sərf etmir; müştərini itirirlər. Bütun Azərbaycanda kiçik vaxt ərzində dükanlar başqa qanunla işləməyə başladı.

Deməli sistemin düzgün qurulmaması, vicdansızlıq, kobudluq, camaatdan əyri yolla pul qoparmaq xüsusiyyətlərini aşılayırdı. İnsanların psixologiyasını pozurdu.

Sistemi, qanunları dəyişməklə dövlət elə edə bilər ki, insanlara rüşvət almamaq, peşəkar olmaq, öz avtoritetini qorumaq daha sərfəli olsun. Və bu keyfiyyətləri olan adam daha böyük uğular qazansın. Rüşvət al-

maq isə elə böyük faciəvi risk olsun ki, heç kəs o risqə getmək istəməsin (əlbətdə, dünyanın hər yerində o risqə gedənlər həmişə olacaq, ancaq bizdəki kimi mindən-mini yox, mindən biri, mindən ikisi). Çox qabiliyyətli, istedadlı, işini yüksək səviyyədə bilən peşəkərlar var ki, bu gün də rüşvət alırlar, rüşvət verilər, çünki şərait elədir ki, heç aldıqları maaş günlük bazarlıq pulu deyil və başqa keyfiyyətləri istedaddan, peşəkarlıqdan daha əsas hesab olunur.

Azərbaycanda elə mühit, elə şərait yaradılmalıdır ki, (əlbətdə qanunlar vasitəsi ilə), o şərait, mühit insanları əyri yola sürükləməsin, qanunlara əməl etməyə tərəf çəksin.

Və son olaraq demək istəyirəm ki, bu yazıda məqsədim kimisə günahlandırmaq deyil, istəyim odur ki, rüşvətsiz Azərbaycanda yaşayaq, qanunların idarə etdiyi, qanunların ali olduğu Azərbaycan vətəndaşları olaq.

*"Millət" qəzeti,*
*02.03.1996*

## BU GÜNKÜ TƏLƏBƏLƏR AZƏRBAYCANIN GƏLƏCƏYİNƏ SAHİB ÇIXA BİLƏCƏKLƏRMİ?

Bir dəfə bütün qrup ilə müəllimi aldatdıq; – İmtahan götürən müəllimə dedi ki, hamımız pul yığmışıq, imtahandan sonra verəciyik, müəllim də razılaşmışdı.

Hamımıza qiymət yazdı. Ancaq ona heç nə vermədik. Bir də ondan imtahanımız olmayacaqdı. Həmin müəllim növbəti imtahan verəcəyimiz müəllimə başına gələn əhvalatı danışdı. O müəllim də qrupun yarısına "iki" yazdı.

...Biri mini geyinir, biri norka şuba geyinir, biri kefindən cüllütfason gəzir. Birinin də geyinməyə nə ayaqqabısı, nə də pal-paltarı var. Tələbə üçün eyni forma məcburi olmalıdır ki, biri o birisinin yanında pisikməsin.

***

...Biri cibindən dollarlar çıxardır, o biri manata həsrətdir. ...Biri bir dərs buraxmır, səhərdən axşama oxuyur, "üç", "dörd" alır. Biri nə dərsə gedir, nə dərs oxuyur, "4", "5" alır.

...Biri dərsə xarici maşınlarda gəlir, biri tramvaya pul tapmır.

***

...Bəzi müəllimlər özləri üçün təhlükəli olmayan adamın (bunu müəllimlər əla bilirlər) uşağını tapşıranda, müəllim çox vaxt pul söhbəti eləmir, söz verir ki, arxayın olun qiymətini yazacam. Arxayın olurlar, uşaq da heç nə oxumur, "iki" alır. Müəllim bir bəhanə gətirir ki, bəs filan şey mane oldu, ona görə yaza bilmədim, ikinci dəfə yazacam. Arxayın olurlar, uşaq yenə oxumur, imtahana gedir, yenə "iki" verirlər. Müəllim yenə, əvvəlkindən də yekə bəhanə ilə, bir az da şübhəli deyir ki, qiymət yazacam.

Valideyn, uşaq artıq heç cür arxayın ola bilmirlər. Müəllim isə eyham edir ki, belə vəziyyətdə, məsələn, imtahanın qiyməti 1000 dollardır, amma onlara hörmət edəcəyəm. Axır ki, istədiyi vəziyyəti yaradır və istədiyini alır.

***

...Vallah, baş aça bilmirəm bizdə bir-iki müəllim var, rüşvət almır. Guya bunlar rüşvət almamaqla dünyanı dəyişəcəklər.

***

İndi tələbələr arasında bu cür söhbətləri hər birimiz eşidirik. Tələbələrin psixologiyası bu cur düşüncələrin üzərində formalaşır.

Sovet dövründə institutlara, universitetlərə, məlumdur ki, əsasən, diploma görə gedirdilər. Diplomun olmasa, qabağa gedə bilməzdin (necə ki, kommunist olmasan, qabağa gedə bilməzdin).

O dövrdə institutlarda işləyən adi laborant çox hörmətli adam idi. Ona görə də dolanışığı çıxırdı, cəmiyyətdə rolu var idi və gələcəyi çox işıqlı görünürdü. Professorlar, akademiklər də ki, heç, onlar barmaqla göstərilirdilər. Bir nəsildə bir professor var idisə, bütün nəsilin işi yaxşı gedirdi. Ona görə də tələbələrin içindən müəllim, professor olmaq istəyənlər var idi. Və belələri yaxşı oxuyurdular, çalışırdılar.

Bəs, indi niyə institutlara, universitetlərə gedirlər? İndi Azərbaycanda vəziyyət elədir ki, diplomun olması sənə nə işlə təmin olunmağa, pis-yaxşı dolanmağa təminat verir, nə də yaxşı mütəxəssis olmağa. Qabağa getmək üçün başqa şeylər vacibdir.

Görünür hələ ki, ali məktəblərə, əsasən köhnə ətalətlə gedirlər. – Valideynlər beyinlərində keçmişin havası ilə uşaqlarını institutlarda görmək istəyirlər.

Respublikada müharibə gedir, ali məktəblərdə oxuyanlar əsgərliyə aparılmır. Valideynlər çalışır ki, xüsusi ilə, oğlan uşaqlarını ali məktəblərə salsınlar.

Azərbaycanda vəziyyət bu cür davam etsə, bugünkü tələbələr valideyn olanda, hələ sosializm dövründə yetişmiş professor, müəllim heyyətini yeni yetişən müəllimlər nəsili əvəz edəndə, Allah qoysa, müharibə

qurtaranda Azərbaycandakı alı məktəblərə getmək marağı, demək olar ki, xeyli zəifləyəcək.

Bu günkü tələbələr hansı istəklə, hansı psixologiya ilə ali məktəbləri qurtarıb, sərbəst həyata atılırlar? Hansı istəklə Azərbaycana qulluq etməyə başlayırlar? – hamımıza bəlli olan bir istəklə: – hansı sahədə rüşvət almaq şansı daha çoxdursa, valideynlərinin, pulun, yerlilərinin köməyi ilə çalışıb o sahələrdə işə düzəlmək istəyirlər.

Yəni ali məktəblərin "yetişdirib" müstəqil həyata atdığı "mütəxəssislər", əsasən, Azərbaycanı qurmaq istəyi ilə həyata atılmırlar, daha çox Azərbaycanı talamaq, var-dövlət sahibi olmaq arzusunda olurlar.

...Və iş orasındadır ki, bu cür psixologiyanın, istəyin formalaşmasında tələbənin o qədər də günahı yoxdur. Ali məktəblərdə hökm sürən "həqiqətlər" tələbənin psixologiyasını belə formalaşdırır.

Bəli, inkar olunmaz həqiqətdir ki, Azərbaycanın taleyi bugünkü tələbələrin – gənclərin əlində olacaq. Əgər bu gün tələbələrdə Azərbaycana qarşı bu cür psixologiya formalaşırsa, Azərbaycanın gələcəyi qaranlıq görünürmü?...

*"Millət" qəzeti,*
*22.06.1996*

## DEMOKRATİK SEÇKİLƏR KİMİN XEYRİNƏDİR?

Azərbaycanda demokratik seçki keçirilməsi hər şeydən əvvəl Azərbaycan xalqının xeyrinədir. Bu bizə dövlətçiliyimizin daha da möhkəmlənməsi, qüdrətlənməsi üçün lazımdı. Demokratik seçkinin keçirilməsi bütün beynəlxalq təşkilatların, Amerikanın, Avropa dövlətlərinin, digər dünya dövlətlərinin Azərbaycana qarşı olan münasibətlərinin daha da yaxşılaşması, Azərbaycan vətəndaşının özünü daha qürurlu, ləyaqətli hiss etməsi deməkdi.

Bütün bunları xatırlatdıqdan sonra görək, seçkiyə sayılı günlər qalmış bir vaxtda, bu günki Azərbaycanın reallığı necədi? Bugünkü Azərbaycanda seçicilərin əhval-ruhiyyəsi, onların iqtidara, hakimiyyətə gəlmək istəyən müxalifətə qarşı münasibəti necədi?

Yəqin ki, həm iqtidarda qalmaq istəyən bugünkü iqtidar, həm də iqtidara gəlmək istəyən müxalifət, bugünkü reallıqdan baxaraq, soyuqqanlı, səssiz-küysüz, lap tutaq elə özləri üçün, tam reallığa əsaslanıb sorğular aparıblar, seçicilərin iqtidara və hakimiyyətə gəlmək istəyən müxalifətə qarşı səslərinin faiz nisbətini dəqiqləşdiriblər.

Bugünkü reallığa əsaslanaraq, bəri başdan deyim ki, bu nisbət, müqayisə olunmayacaq dərəcədə iqtidarda olan prezidentliyə namizəd İlham Əliyevin xeyrinədi.

...Və əlbəttə, 9 oktyabra qədər qalan müddətdə, bu gün hakimiyyətdə olan iqtidar, hakimiyyətdə qalmaq üçün aparacağı təbliğatla çalışacaq ki, onun xeyrinə olan faiz nisbətini daha da artırsın, ən azı isə o nisbətin aşağı düşməsinə imkan verməsin.

İqtidara gəlmək istəyən müxalifət isə əlbəttə, bütün gücü ilə çalışacaq ki, aşağılarda olan faiz nisbətini öz xeyrinə dəyişsin.

Seçici o vaxt hakimiyyətə gəlmək istəyənə və ya hakimiyyətdə qalmaq istəyənə səs verir ki, o, əməli işlərdə görür, onun üçün, onun yaşadığı bölgə üçün, ümumi respublika üçün hansı xeyirli işlər görülür. Onun yaşadığı kənddə, rayonda, şəhərdə quruculuq işləri gedir; yollar çəkilir, su, qaz, işıq fasiləsiz verilir. Fabriklər, zavodlar qurulur, iş yerləri açılır. Məşğul olduqları özəl işləri genişləndirmək və ya fikirlərində olan biznes layihələri həyata keçirmək üçün kreditlər verilir.

Beynəlxalq səviyyədə onun vətəni olan Azərbaycanın maraqları yüksək səviyyədə təmsil olunur və qorunur. Müstəqillik tarixi o qədər də çox olmayan Azərbaycanın get-gedə beynəlxalq səviyyədə nüfuzu qalxır.

Seçicilər şahidi olurlar ki, bugünkü iqtidar Azərbaycanda apardığı siyasətlə, iştirakçısı olduğu və ya özü-

nün təşəbbüsü ilə həyata keçirdiyi beynəlxalq səviyyəli iqtisadi layihələrlə məcbur edir ki, məhz beynəlxalq səviyyələrdə Azərbaycanla hörmətlə davransınlar, Azərbaycanla hesablaşsınlar.

Qısa müstəqillik tariximizdə beynəlxalq aləmdə Azərbaycanın təbliğatına, necə deyərlər, reklamına çox böyük ehtiyac var. Və bütün cəmiyyət görür ki, bu istiqamətdə çox vacib, sistemli, ardıcıl işlər görülür – özü də, həm Azərbaycanın xaricində, həm də daxilində.

Azərbaycan sistemli, hərtərəfli inkişaf xətti götürüb və bu inkişaf çox effektli surətdə aparılır. İstər quruculuq işləri, istər mədəniyyət sahəsində görülən işlər olsun, istər Azərbaycanın dünya səviyyəsində tanınması istiqamətində, istər energetika ilə bağlı, iqtisadiyyatla, idmanla, səhiyyə və təhsil ocaqlarının tikintisi ilə bağlı görülən işlər olsun.

Seçicilər çox yaxşı görürlər ki, Azərbaycanın hər kvadrat metri gözlərimiz qabağında yenidən qurulur; – istər Respublikanın paytaxtı Bakı şəhərində, istərsə də, bütün regionlarda.

Ona görə də seçicilər bu cür dinamik, ardıcıl, hərtərəfli, böyük sevgi ilə aparılan inkişafın hakimiyyətdə olan iqtidarın davam etdirməsini istəyir.

Onu da qeyd etməliyik ki, seçicilər onu da eşidirlər, oxuyurlar ki, aparılan işlər zamanı korrupsiya halları və digər çatızmazlıqlar olur. Əlbəttə, onların olmaması lazımdı, amma görülən işlərlə, mənfi halları müqayisə

edəndə seçicilər üçün tərəzinin birinci gözü xeyli ağır gəlir.

İnkarolunmaz faktdır və bunu, əlbəttə, seçicilər yaxşı görürlər ki, hakimiyyətdə olan iqtidarın apardığı siyasət nəticəsində Azərbaycan həm regionda, həm də beynəlxalq səviyyədə söz sahibi olan bir dövlətə çevrilir.

Bu cür reallıqların ortada olduğu bir halda, əlbəttə, iqtidarda olan öz tərəfindən heç cür imkan verməməlidir ki, seçkilərdə hansısa pozuntular olsun. Bütün mümkün olan beynəlxalq təşkilatları dəvət etməlidir ki, gəlib Azərbaycanda keçirilən seçkiləri izləsinlər. Seçkilərin necə demokratik, şəffaf keçirilməsinin şahidi olsunlar.

Bu cür yanaşma mövqeləri onsuz da çox möhkəm olan bugünkü iqtidarın mövqelərini daha da möhkəmləndirəcək. Bunun belə olması isə yuxarıda deyildiyi kimi, hər şeydən əvvəl, Azərbaycan xalqına lazımdır. Beynəlxalq ictimaiyyət üçün lazımdır və əlbəttə, iqtidarın həm daxildə, həm də beynəlxalq aləmdə mövqelərinin daha da möhkəm olması üçün lazımdır.

Və seçicilər qəti şübhə etmirlər ki, prezidenliyə namizəd olan bugünkü Azərbaycanın Prezidenti İlham Əliyev yenidən prezident seçiləcək və növbəti prezidentlik müddətində daha böyük uğurla Azərbaycanda gedən hərtərəfli inkişaf, quruculuq işlərini davam etdirəcək.

*"525-ci qəzet",*
*25.09.2013*

# AZƏRBAYCAN XALQI HƏM DƏ SAHİBKAR XALQDI

Azərbaycan xalqını şair xalq adlandırırlar. “Şair xalq” olmaqda mənfi bir şey yoxdu, şairlik çox yüksək pillədi, amma əlavə etmək lazımdı ki, xalqımız həm də sahibkar xalqdı. Bu, çox böyük dəyərdi və hər xalqda bu xüsusiyyət olmur.

IX və XI sinif şagirdləri üçün nəzərdə tutulan “İqtisadiyyatın əsasları” dərslik kitabında, ürəyimcə olan belə bir fikir var: “Xüsusi istedad qabiliyyəti və bacarığı olmayan şəxslərdə sahibkar olmaq cəhdi heç vaxt baş tuta bilməz. Sahibkarlar bəşəriyyətə maddi nemətlər bolluğu gətirən islahatçılardı. Onlar bu gün ilə gələcək arasında əlaqələndirici rol oynayırlar. Sahibkar hər bir xırda şeyi görmək və ondan düzgün nəticə çıxarmaq qabliyyətinə malik olan şəxsdir”.

Bəli, sahibkarlıq yaradıcı keyfiyyətdi. Bizim neftdən də, qazdan da üstün nemətimiz torpağına, ailəsinə bağlı, işgüzar, sahibkarlıq keyfiyyətləri yüksək olan Xalqımızdı. Sahibkar aydınlığı, şəffaflığı, konkretliyi xoşlayan bir zümrədir. Onun üçün münbit şərait yaradılanda çox sürətlə ideyalarını gerçəkləşdirə bilir. Prezidentin də dediyi kimi bizim dövlətimizin inkişafı, gələcəyi, sahibkarlığın inkişafı ilə bağlıdı.

Sahibkarlıq hansı anlamı kəsb edir? Məsələn, bir yol ideal formadadırsa, hər tərəf tikilib qurulubsa, orda sahibkara elə də ehtiyac yoxdu. Amma bir yerdə yol dağılıbsa, başqa çatışmazlıqlar varsa, orda sahibkara meydan yaranır ki, yolu çəksin, digər yerləri sahmana salıb qursun, yaratsın.

Prezidentin sahibkarlar, onların fəaliyyəti üçün şəraitin yaradılması ilə bağlı dediyi fikirləri əsas götürüb, xüsusi ilə də, neftin qiymətinin belə aşağı düşdüyü bir vaxtda bu sahəni təbliğ etmək, sahibkarlar zümrəsinin fəaliyyətinin dövlətimiz üçün nə qədər əhəmiyyətli olmasını xalqımıza çatdırmaq lazımdı.

Dünyada ən güclü dövlətlər hansılardır? Məlumdur ki, Amerika ilk sıradadır, sonra Çin, Yaponiya, Almaniya və s. gəlir.

Onların gücü nədədi? Təbii ki, Ümumi Daxili Məhsullarının (ÜDM) həcmində. ÜDM kimlərin hesabına yaranır? Əlbəttə ki, sahibkarların fəaliyyəti hesabına. Həmin inkişaf etmiş ölkələrdə ÜDM-in hardasa 70-75 faizi dövlətin və özəl sahənin vətəndaşlara göstərdikləri xidmətlərdən formalaşır. Biz də istəyirik ki, Azərbaycanımız güclü, qüdrətli bir dövlət olsun, ÜDM-i sürətlə artsın, xalqımız daha firavan yaşasın. Azərbaycan elə böyük ölkə olmasa da, balaca da deyil. Götürək Avropanı. Avropada 49 dövlət var ki, onlardan hardasa, yalnız 12-si bizdən ərazicə və əhalisinin sayına görə daha böyükdü. Qalanlarından isə ən azı bir göstə-

riciyə görə biz üstünük. ÜDM-yə görə isə biz ancaq 12 Avropa dövlətlərindən daha irəlidəyik.

Sahibkarların fəaliyyəti televiziyada, mətbuatda davamlı olaraq təbliğ edilməlidir.

Azərbaycanın turizm sahəsində çox böyük potensiali var. Belə ki, məlum olduğu kimi, dünyada mövcud olan 11 iqlimin 9-u bizdədir, dənizimiz, gözəl dağlarımız, zəngin mətbəximiz, çox qonaqpərvər, istiqanlı, tolerant xalqımız var. Ətrafımızda istirahət məkanlarına ehtiyacı olan nəhəng Rusiya, Ukrayna xalqı, Azərbaycanı həmişə ziyarət etmək istəyən İranda yaşayan 35 milyon soydaşımız, Gürcüstanda yaşayan azərbaycanlılarımız var. Yəni, münbit şərait yarada bilsək bütün bu özəlliklərimizə görə Azərbaycana çox böyük turist axını ola bilər.

Bizdə kütləvi turizm demək olar ki, yox dərəcəsindədi. Kütləvi turizm dedikdə nə nəzərdə tutulur? Türkiyədə, elə qonşumuz Gürcüstanda Batumiyə çatmamış Kabuletidə, bəlkə də 10 kilometr dəniz boyunca görürsən ki, turist əlindən tərpənmək olmur. Sağda dəniz, çimərlik, dəniz boyunca sıralanan kafelər, restoranlar, əyləncə mərkəzləri, yolun solunda isə saysız hesabsız otellər və müvafiq obyektlər. İmkan yaradılıb ki, insanlar öz evlərini qonaq evlərinə, kiçik otellərə, kafelərə, restoranlara uyğunlaşdırsınlar, yenilərini tiksinlər.

Lazım olanda, onlara elə də böyük olmayan kreditlər verilib. Turistlər kütləvi şəkildə – dənizin yaxınlı-

ğında elə də baha olmayan qonaq evlərində, üçulduzlu, dördulduzlu mehmanxanalarda məskunlaşırlar. Digər ölkələrdən gələnlərlə, yerli əhali ilə ünsiyyət qurur, fikir mübadiləsi aparır, turlar üçün ayrılmış avtobuslarla tarixi yerləri ziyarət edirlər. Və növbəti il həmin yerə bir də gəlir, həmçinin bu məkanı digərlərinə təbliğ edir.

Vergi orqanları, digər təşkilatlar həmin qonaq evlərinin, kafelərin, restoranların sahiblərini sıxışdırmır, əksinə onlara sevgi ilə, vergiödəyicisi kimi münasibət bəsləyirlər. Yəni bu məsələdə ümumi dövlət mənafeyi nəzərə alınır, daha ayrı-ayrı şəxslərin, yaxud qurumların mənafeyi yox. Dövlətin mənafeyi də ondan ibarətdi ki, ölkəyə daha çox turist cəlb olunsun və onlar valyuta gətirsinlər. Bu valyutalar hesabına milli məzənnə stabilləşir, turistin hesabına büdcəyə daxilolmalar artır.

Bizdə çox gözəl, yüksək səviyyəli beşulduzlu mehmanxanalar inşa edilib. Əlbəttə, belə mehmanxanaların da öz müştəriləri var, amma yalnız bu növ mehmanxanalarla turizmi kütləviləşdirmək olmaz. Bizdə kütləvi turizm üçün saysız-hesabsız səfalı məkanlar var. Məsələn, Novxanıdan keçib dənizə çatanda, balaca bir dairə var, düz ordan başlayaraq Sumqayıt istiqamətində uzun yol uzanır – sağ tərəf dəniz, çimərlik, çimərlikdən sonra dəniz boyunca düz Sumqayıta kimi saysız hesbsız kafe, restoranlar, yolun sağında isə yenə kafe, restoranlar, tək-tük mehmanxanalar, çoxlu gözəl villalar, bağ evləri var. Bircə o qalır ki, bütün bu olan-

lar bir-biriylə əlaqəli şəkildə iş qursun, müəyyən koordinasiya islahatları aparılsın. Bu zaman turistlər üçün əlverişli, rahat şərait yaratmaq olar. Bu, həmin kafe, restoran sahiblərinin də ürəyincə olar. Bağ sahiblərinə lazım gələrsə müəyyən həcmdə kreditlər vermək lazımdı ki, buranı qonaq evlərinə, kiçik mehmanxanalara uyğunlaşdıra bilsinlər. Həm özləri qazanc əldə etsinlər, həm yeni iş yerləri açsınlar, ən əsası isə dövlətə vergi ödəsinlər.

Kənd təsərrüfatı sahəsində də çox böyük potensialımız var. Belə ki, münbit torpaqlarımız, münasib iqlimimiz, ən başlıcası işgüzar, zəhmətkeş xalqımız var.

Həlli vacib məsələlərdən biri də odur ki, gərək bu sahədə çalışanların alın tərləri bahasına ərsəyə gətirdikləri məhsulu satmaq problemləri olmasın. Yaxşı olardı ki, hər yerdə məhsulların tədarükü mərkəzləri yaradılsın, kəndli – fermerlərin becərdikləri məhsullar münasib qiymətə onlardan alınsın, əvvəlcədən avanslar verilsin, məhsullar yüksək səviyyədə qablaşdırılıb, Azərbaycan brendi adı altında xarici bazalara çıxarılsın. Bu məsələ həllini tapsa kənd təsərrüfatı məhsullarının istehsalı dəfələrlə artar.

Xaricdə yaşayan biznesmen soydaşlarımızı da dəvət etməli, onlara şərait yaradılmalıdı ki, gəlib dədə-baba torpaqlarına yatırımlar etsinlər. Əgər onlar üçün münbit şərait yaradılarsa, məmnuniyyətlə qısa müddət ərzində, böyük yatırımlar edərlər.

Müvafiq sturukturlar bidirirlər ki, ölkədə sahibkarlıqla məşğul olan 662 min şirkət və fiziki şəxs var. Bizneslə məşğul olan subyektlərin sayını, onlar üçün daha yaxşı şərait yaratmaqla, sahibkarlıqla məşğul olanların sayını milyona çatdırmaq olar. Bu isə dövlət büdcəsinə əlavə milyardlarla ölçülən daxilolmalar deməkdir.

Bəxti gətirmiş xalqlardanıq ki, Tanrı bizə belə münbit, barlı-bəhərli torpaqlar bəxş edib. Qalır yalnız bu imkanlardan səmərəli istifadə etmək. Necə deyərlər, səndən hərəkət, məndən bərəkət.

*"Aydın yol" qəzeti,*
*06.02.2016*

# O ZƏNG HƏM DƏ BİZİM ÜÇÜN ÇALINIR

Sadədən sadə bir həqiqət var: – Hər şey o vaxt inkişaf etməyə başlayır ki, bunun üçün şərait, mühit, tələbat yaranır. Bu, mədəniyyətdə də belədir, iqtisadiyyatda da. Əgər neqativ halların inkişafı o biri sahələri qabaqlayırsa, deməli, dövlət ya özü hiss etmədən, ya da qəsdən həmin neqativ halların inkişaf etməsi üçün şərait yaradır.

Əgər dövlətin siyasəti çevikdirsə, qanunları bütün sahələri əhatə edirsə, yaranan və ya yaranacaq tələbatlar proqnozlaşdırılır və elə istiqamətləndirilir ki, yaradılanlar dövlət üçün, xalq üçün sərfəli olur. Dövlətin nəzarətindən heç nə kənarda qalmır. Yox, əgər, dövlətin qanunları hadisələrin dalınca gedirsə, yaranan boşluqlara, dövlətin nəzarətindən kənarda olan strukturlar "əl qoyurlar".

1988-ci ildən başlayaraq Rusiyada, Ukraynada və digər keçmiş müttəfiq respublikalarda mütəşəkkil cinayətkarlıq gözlərimizin qabağında yaranmağa başladı və get-gedə möhkəmlənib, şaxələnib, demək olar ki, dövlət içində dövlətə çevrildi. Köhnə ictimai quruluş dağılırdı, yenisi hələ yaranmırdı, dövlətin nəzrə-

tindən kənarda qalan “boşluqlar” əmələ gəlirdi. Və o “boşluqlar” tələbat yaratdı ki, cinayət aləminə meyllilər qol-qanad açsın, möhkəmlənsin.

Cinayət aləminin ruşeymi – virusları hər bir cəmiyyətdə həmişə olur, onlar üçün şərait yaranan kimi, həmin “viruslar” başlayırlar inkişaf etməyə.

Mafioz strukturların yazılmamış qanunları var. Hər kəs dediyi sözün, görülən əməlin məsuliyyətini bilir, əməl olunmayan sözə, işə görə hansı cəzanın mövcudluğunu bilirlər. Və cinayətkar aləmi, yazılmamış qanunları təkcə quru sözlə, xofla saxlamır, həm də, onları qoruyur, tətbiq edir, işlərinin görülməsi üçün “qarant” olur.

Dövlətdə isə, yerinə yetirilməyən işə görə, bütün pozuntulara görə qanun qarşısında cavabdehlik hiss olunmur. Başqa sözlə cinayətkarlar aləmində yazılmamış qanunlar işləyir, dövlətdə isə, yazılmış qanunlar işləmir.

...Azərbaycanda mütəşəkkil cinayətkarlıq ona görə Rusiyadakı, Ukraynadakı kimi birdən-birə meydana çıxmadı ki, Rusiyadan, Ukraynadan fərqli olaraq birləşmələr, qruplaşmalar bir az başqa formada olsa da, bizdə çoxdan var idi. Çünki Rusiyada, Ukraynada yeni yaranan reket qrupları gəlirli yerlərə, ticarət obyektlərinə, mağazalara, restoranlara, kafelərə digər pul çıxan yerlərə haqq qoyurdularsa, Azərbaycanda həmin yerlərin sahibləri neçə illər idi ki, haqq verirdilər. Yəni Azər-

baycanda həmin "boşluq" çoxdan doldurulmuşdu. Azərbaycanda haqqı dövləti təmsil edənlərə verirdilər, Ukraynada, Rusiyada isə dövləti təmsil etməyənlərə. Azərbaycanda onların adı milis, prokurotura OBXSS, birinci katib və s. idi, o tərəflərdə isə reket. Amma ədalət naminə deyək ki, Rusiyada, Ukraynada mütəşəkkil cinayətkarlıq elə sürətlə inkişaf etdi ki, Azərbaycanı ötüb keçdi. İndi Azərbaycanın müvafiq "strukturları" başlayıblar, müvafiq respublikalardan öyrənməyə, görüb-götürməyə Azərbaycanda bu cinayət strukturların inkişafı üçün münbit şərait görüb başqa yerlərdən də buraya axın başlaya bilər.

...Fikrimi ümumiləşdirərək demək istəyirəm ki, belə davam etsə, cinayətkar qruplaşmalar Bakını öz nüfuz dairələrinə görə hissələrə bölməyə başlayacaqlar. Çünki "razborşiklər" tələbatın çoxaldığından, onlar püxtələşir, peşəkarlaşırlar. Bu səbəbdən də onlarla mübarizə getdikcə çətinləşir.

...Və mən son olaraq demək istəyirəm ki, Azərbaycanda son zamanlar yaranmış bu sosial bəlaya qarşı tamaşaçı rolu ilə kifayətlənməyə haqqımız yoxdur. Çünki bu zəng bizim hər birimiz üçün çalınır. Hüquq-mühafizə orqanlarının öz işinin öhdəsindən gəlmədiyini söyləmək isə məncə, artıqdır.

*"Millət" qəzeti,*
*07.01.1995*

## QANUN HƏM VƏTƏNDAŞ, HƏM DƏ DÖVLƏT ÜÇÜN MƏCBURİDİR

Azərbaycandan Türkiyəyə gedəndə ən böyük fərq bilirsinizimi nədə hiss olunur? Türkiyənin sərhədindən içəri ayaq basan kimi dövlətin və qanunlarının varlığını duyursan. Görürsən ki, dövlət məmuru oturub və ondan yuxarıda, başının üstündə onu idarə edən qanun "oturub". Eyni sözü sürücünün də, ticarətçinin də, nazirin də haqqında demək olar.

Azərbaycanda isə bunu hiss edə bilmirsən. Əlbəttə, orası da məlumdur ki, Türkiyədə, Avropa dövlətlərində, Amerikada və s. dövlətlərdə dediklərimiz birdən-birə yaranmayıb. Həmin dövlətlər neçə illərin, neçə yüz illərin dövlətləridir. Və bugünkü vəziyyətə gəlib çıxana kimi əzablı yol keçiblər. Artıq bu dövlətlərin güclü dövlətçilik ənənələri yaranıb, formalaşıb.

Azərbaycanda indi ən böyük çatışmazlıq, dövlətçilik ənənələrinin olmamasıdır. Azərbaycan Respublikası cəmi 5 ildir müstəqilliyini elan edib. Əlbəttə, bu dövlətçilik üçün çox qısa bir tarixdir. Amma nədənsə, dövlət televiziyasında, dövlət mətbuatında ardıcıl dövlətçiliyin, dövlətçiliyin əsasını təşkil edən qanunların təbli-

ği getmir. Bunun əvəzinə, televiziya, dövlət mətbuatı xalqa yaltaqlıq, yalan danışmaq, qeyri-səmimilik və s. psixologiyası aşılayır. Bunlar dövlətçilik üçün çox təhlükəlidir.

Hüquqi dövlətin əsas xarakteristikalarından hansına bizdə dövlət məmurları tərəfindən əməl olunmasına baxaq:

***– Qanunların ictimai həyatın bütün sahələrində hegemonluğu varmı?***

***– Hər bir vətəndaşın hüquqlarının həyata keçirilməsi, onun inkişafı üçün azad şəraitin yaradılması. Başqa sözlə, "qanunla qadağan olunmayan hər şeyə vətəndaşın haqqı var prinsipi" varmı?***

***– Dövlət və vətəndaşın qarşılıqlı məsuliyyətləri, başqa sözlə, "qanunla hakimiyyətə verilməyənlər, hakimiyyət üçün qadağandır" – varmı?***

***– Qanunların möhkəm rejimi, hüquqi nizam-intizam sabitliyi varmı?***

***– Və nəhayət, hüquqi dövlətin təşkilinin və fəaliyyətinin əsasında duran hakimiyyət bölgüsünə riayət olunurmu?***

Zənnimcə, bu suallara müsbət cavab vermək çətindir.

Azərbaycan Demokratik Respublikasının ilk baş naziri olan Fətəlixan Xoyskinin bizlərlə qoyub getdiyi və bu gün üçün çox aktual olan bir vəsiyyəti var: **"Biz türklər heç bir zaman özümüzü Vətənə övlad kimi**

**görə bilməmişik, həmişə ögey olduğumuzu hiss etmişik. İndi biz elə şərait yaratmalıyıq ki, Vətənimizdə yaşayan vətəndaşların hamısı özünü bərabər vətən övladları kimi görsünlər".**

Azərbaycanda əsas məqsədimiz hüquqi, dünyəvi dövlət qurmaqdırsa, Kantın dediyi kimi: ("Dövlət çoxsaylı insanların qanunlarla birləşməsidir") Biz Azərbaycan vətəndaşlarını bir-birimizə qanunlar birləşdirilmədir. Və vətəndaşlar bir-biriləri ilə, əgər başqa əsaslarla birləşirsə, bu, təkcə onların günahı deyil, daha çox dövlətin qurulmasında buraxılan səhvlərin nəticəsidir.

Mən bu yazını hələ bizim eradan əvvəl Sokratın dövlət haqqında dediyi fikirlə bitirmək istərdim: "Dövlət – insanların elə ən ağıllı və ədalətli ünsiyyət formasıdır ki, bu zaman qanun həm vətəndaş, həm də dövlət üçün məcburidir".

*"Millət" qəzeti,*
*15.06.1996*

# MƏN AZƏRBAYCANA FƏTƏLİXAN XOYSKİNİN NƏVƏSİ KİMİ GƏLMƏK İSTƏYİRƏM

1992-ci il sentyabr ayında Türkiyənin məşhur kurort şəhəri Yalovada keçirilən XIII beynəlxalq folklor rəqs festivalına dəvət olunmuşduq. Və biz həmin festivalda respublikanın xalq artisti Əminə xanım Dilbazinin rəhbərlik etdiyi "Çinar" rəqs ansanblı ilə iştirak edirdik. Festival çox yüksək səviyyədə keçdi. Biz 12 dövlətin nümayəndələri ilə birgə neçə şəhərlərdə çıxış edib, Azərbaycanı təmsil edirdik. Həmin festival haqqında mətbuatda, televiziyada geniş məlumat verilib. Bu yazıda isə, mən festival vaxtı İstanbulda təsadüfən tanış olduğum Fətəlixan Xoyskinin qız nəvəsi Kərim Məhmətzadə haqqında yazmaq istəyirəm. Elə düşünürəm ki, Azərbaycan Demokratik Respublikasının ilk hökümətini quran, dörd dəfə nazirlər şurasının sədri, daxili işlər naziri Fətəlixan Xoyskinin anadan olmasının 120 illiyi ərəfəsində bu yazı oxucular üçün də maraqlı olar.

Festival artıq başa çatmışdı. İstanbulda "Çinar"ın qızları, bir də mən gəlinlik paltarları satılan dükanın qabağında dayanmışdıq. Dükandan əlli-əlli beş yaşlı,

səliqəli geyimli, eynəkli bir kişi çıxdı, bizə yaxınlaşdı, salamlaşdı, xoş gəlibsiniz – dedi. Özünü təqdim etdi ki, bu dükanın sahibidir. Sonra da bizdən soruşdu ki, Azərbaycandansınızmı? Cavab verdik ki, bəli.

Girişsiz-filansız, birbaşa soruşdu ki, Fətəlixan Xoyski kim olub, eşidibsinizmi?

Mən cavab verdim ki, Fətəlixan Xoyski 1918-ci il mayın 28-də yaranan Azərbaycan Demokratik Respublikasının ilk Nazirlər Şurasının sədri və daxili işlər naziri olub.

İstəyirdim Xoyski haqqında yenə məlumat verim. Kişi sözümü kəsdi. Onun üzünə birdən-birə elə bil işıq gəlmişdi.

Mənə təşəkkür edə-edə deyirdi ki, bu çarşıya nə qədər Azərbaycandan gələnlər olub. Fətəlixan Xoyskinin kim olduğunu soruşmuşam, bəxtimdən indiyə kimi onu tanıyanla rastlaşmamışdım ki, kim olduğumu onlara danışım. Çox-çox şükürlər olsun ki, Siz tanıdınız. Mən həmin Azərbaycan Demokratik Respublikasının Nazirlər Şurasının sədri olan Fətəlixan Xoyskinin qız nəvəsiyəm.

Öyrəndik ki, adı Kərim, soyadı Məhmədzadədir. Kərim bəy dedi ki, İstanbula gəlib çıxmaqlarının tarixçəsi çox uzundur, inşallah, qismət olsa, onları Azərbaycana gələndə danışaram. İndi bizim nəsildən qalanlar deyəsən, elə bizlərik. Yaxşısı budur, sizlərə Xoyskilərdən danışım.

Xoyskilər Azərbaycan tarixinə iz qoyub gedən nəsillərdəndir. Fətəlixanın ulu babası Cəfərquluxan

İran şahı Fətəlixanla müharibədə məğlub olduqdan sonra indi Ermənistan torpağı hesab olunan Uçkilsədə məskunlaşır. 1803-1806-cı illər İran-rus müharibəsində Fərəcquluxan ruslar tərəfindən vuruşur və Aleksandr onu müharibədə göstərdiyi şücaətlərinə görə üstü brilyantla işlənmiş qızıl medalla təltif edir. XIX əsrin əvvəllərində Cəfərquluxan Şəki xanı təyin olunur. General-leytenant rütbəsinə kimi yüksəlir. Cəfərquluxanın ölümündən sonra Şəki xanlığını onun oğlu İsmayıl idarə edir. İsmayıl Xoyskidən sonra, Şəki xanlığı Rusiyanın tərkibinə qatılır. Fətəli xanın atası da rus ordusunun general-leytenantı olmuşdur. Ümumiyyətlə, bu nəsildən çoxlu görkəmli sərkərdələr, dövlət xadimləri, ali təhsilli ziyalılar çıxmışdır.

Fətəli xanın özü də Moskva universitetində yüksək hüquq təhsili almışdır. Gəncə, Suxumi, Batum və başqa şəhərlərin məhkəmələrində yüksək vəzifələrdə işləmişdir. Peterburqda Rusiya parlamentinin iclaslarında çar hökümətinin Zaqafqaziya və Azərbaycanda yeritdiyi müstəmləkəçilik siyasətini pisləmişdir.

Fətəlixan Xoyski heç bir partiyanın üzvü olmamışdır. 1917-ci ildə yaranan Zaqafqaziya Seyminin üzvü və Zaqafqaziya Federativ Respublikasının ədliyyə naziri olmuşdur.

Sonra, 1918-ci il mayın 28-də müsəlman dünyasında ilk dəfə yaranan Azərbaycan Demokratik Respublikasının müstəqil hökümətini qurmaq bitərəf Fətəlixan

Xoyskiyə tapşırılır. Və həmin ilin ortalarında Fətəli xanın rəhbərliyi ilə ikinci dəfə hökümət təşkil olunur. Nazirlər şurasının sədri və daxili işlər naziri vəzifələrini yerinə yetirir. Xəstə olmasına baxmayaraq, parlament təkidlə hökümətin təşkilini daha iki dəfə ona tapşırır.

Azərbaycan Dövlət Universitetinin yaranmasının əsası da, Fətəlixan Xoyski tərəfindən qoyulur. Fətəli xanın təşəbbüsü ilə Gəncə şəhərinin (o zaman Yelizavetopol adlanırmış) adı qaytarılır. Qaryagin qəzasının adı Cəbrayıl qəzası ilə əvəz olunur. Azərbaycan Respublikasının pul vahidi buraxılır.

1919-cu ilin martında Xoyskinin başçılıq etdiyi hökümət istefa verir, 1919-cu ilin axırında Nəsibbəy Yusifbəylinin qurduğu hökümətdə xarici işlər naziri vəzifəsini icra edir. Fətəlixan Azərbaycan Respublikasının xarici dövlətlər tərəfindən tanınması üçün çox böyük işlər görür.

XI Qızıl ordu Bakıya girəndə Fətəlixan ailəsi ilə Tiflisə gedir. Və 1920-ci il iyunun 19-da Tiflisdə həmişə bizə düşmən olan ermənilər tərəfindən arxadan atılan güllə ilə öldürülür. Tiflisdə Azərbaycan dramaturgiyasının banisi Mirzə Fətəli Axundovun qəbri yanında dəfn olunur.

Kərim bəy danışırdı ki, Fətəlixan Xoyski Azərbaycan üçün çox iş görüb, ömrünü Azərbaycana həsr edib. Və Fətəlixanın ömrünü Vətəni Azərbaycana həsr etməsində qeyri-təbii heç nə görmürəm, bu belə də olamlı

idi. Vətənə həsr olunan, Vətənin tarixində qalan ömür ən xoşbəxt ömürdür. Və belə bir xoşbəxt ömür çox şükürlər olsun ki, Fətəli xana nəsib olub. Amma gərək Fətəlixan kimilər özlərinə layiq səviyyədə öyrənilsinlər, təbliğ olunsunlar, onlara oxşayanlar çoxalsın.

Kərim bəy deyirdi ki, mənim çox imkanım olub ki, Azərbaycana gəlim, amma gəlməmişəm, ona görə ki, mən Azərbaycana məhz Fətəli xan Xoyskinin nəvəsi kimi gəlmək istəyirəm.

Mən bu yazını Fətəli xan Xoyskinin axırıncı dəfə hökuməti quranda daxili siyasətə aid proqram çıxışındakı bu gün üçün də çox aktual olan sözləri ilə qurtarmaq istəyirəm: "Biz türklər heç bir zaman özümüzü Vətənə övlad kimi görə bilməmişik, həmişə ögey olduğumuzu hiss etmişik. İndi biz elə şərait yaratmalıyıq ki, Vətənimizdə yaşayan vətəndaşların hamısı özünü bərabərhüquqlu vətən övladları kimi görsünlər. Biz özümüzə rəva bilmədiyimizi, başqalarına rəva bilməməliyik".

*"Millət" qəzeti,*
*02.04.1996*

# "DAŞKƏND VƏ DAŞKƏNDLİLƏR" KİTABINA ÖN SÖZ ƏVƏZİ

Bu kitab, hələlik əlimiz çatmayan Göyçə mahalının Daşkənd kəndinin qəbiristanlığında uyuyan və sonralar dünyalarını dəyişən daşkəndlilərin əziz ruhlarına həsr olunur.

Türk dünyasının böyük yazıçısı Çingiz Aytmatovun belə bir fikri var: "Biz Vətənimizi ona görə çox sevirik ki, uşaqlığımızı orda itirmişik".

...Və bu qarşınızdakı kitabdakı siyahı, Çingiz Aytmatovun təbirincə desək, uşaqlıqlarını, gəncliklərini Göyçə mahalının Daşkənd kəndində itirənlərin siyahısıdır.

Hər şeydən əvvəl onlar Göyçənin bir hissəsi olan Daşkənddə gözəl, mehriban, doğma insanların arasında dünyaya gəlib, uşaqlıqlarını, gəncliklərini onların arasında keçirmişdilər. Böyüyə-böyüyə özlərindən asılı olmayaraq onları əhatə eləyən həmin insanların danışıqları, söz-söhbətləri, davranışları, eşitdikləri əhvalat, nağıl və dastanlar onların varlığına hopmuşdu.

...Belə bir kəlam var, deyirlər, ilk gələn SÖZ olub və hər şey SÖZdən yaranıb. Bu həqiqətdirsə, gör, Göy-

çədə, o cümlədən Göyçənin bir parçası olan Daşkənddə sözün dəyəri Miskin Abdal, Ağ Aşıq, Aşıq Alı, Şair Məmmədhüseyn, Aşıq Ələsgər, Aşıq Nəcəf, Növrəs İman, Usta Abdulla və başqalarının timsalında hansı zirvəyə qalxıb.

Əlbəttə, əgər Göyçədə o mühit olmasaydı, sözü o qədər dəyərləndirməsəydilər bu adlarını çəkdiyimiz saz-söz sərrafları yetişməzdi. Aşıq Ələsgər, Daşkəndli Məmmədhüseyn və digərləri səviyyəsində aşıqların, el şairlərinin yetişməsi üçün, onları əhatə edən mühitdə onların sazlarını, sözlərini dəyərləndirən insanlar olmalı idi. Göyçədə, Göyçənin bir hissəsi olan Daşkənd kəndində sazın, sözün dəyərini bilən insanlar yaşayırdı. Burada hər mənada sözün böyük dəyəri var idi: istər şeir, nağıl, dastanlar formasında deyilən sözlərin, istərsə də adi, gündəlik ünsiyyətdə insanların ağızlarından çıxan sözlərin.

Daşkənd kəndinin qaçqınlığa qədər olan illərinə nəzər salsaq, rəhmətlik Aşıq Hacı Bayramov, Alqayıt, Sərraf Şiruyə Daşkənd söz, sənət mühitinin son dövr yetirmələrindən olublar. Öncə onlar kənd səviyyəsində qəbul olunmuş, o səviyyəyə çatmışdılar ki, kəndin saz-söz bilicilərinin qarşısında oxuya, məclis apara bilərdilər. Sən, səni dinləyənlərdən heç olmasa bir baş yuxarı səviyyəyə qalxmalıydın ki, səni dinləyəydilər, məclis aparmağa dəvət edəydilər. Aşıq Hacı, Alqayıt və Şiruyə bu titulu kənddə qazanmışdılar. Və sazın, sözün səviy-

yəsi Daşkənddə elə yüksək səviyyədə idi ki, Aşıq Hacı bir iki dəfə o vaxtkı Lenin sarayında oxumaqla, Alqayıt müəllim Gəncədə qonaq olanda təsadüfən bir-iki məclis aparmaqla bütün Azərbaycan onları qəbul etdi, şan-şöhrətləri bütün Azərbaycana yayıldı. Sərraf Şiruyə Yeni Daşkənddə, Qarabağda, bütün Azərbaycanda məşhurlaşdı, qüdrətli söz sərrafı kimi qəbul olundu. Sözləri kasetlərdə, məclislərdə dillər əzbəri oldu. Aşıq Hacı televiziyada Aşıq Alının dastanını danışdı, qızıl fonda düşdü. Böyük saz-söz bilicisi Məmməd Aslan bu dastanla bağlı demişdi: "İndiyə kimi nə qədər aşıq dastan danışmışdı, onların danışığında heç vaxt dastançılıq Aşıq Hacının danışdığı dastançılıq səviyyəsinə qalxmamışdı".

Gör, Göyçənin bir hissəsi olan Daşkənddə saz-söz mühiti hansı səviyyədə idi ki, kənddə qəbul olunan saz-söz sərrafları Azərbaycanımız səviyyəsinə bir-iki dəfə çıxan kimi bütün Azərbaycanda sevilir, qəbul olunurdu.

Bəli, bu siyahıdakılar da, o mühitdə böyüyüb sonralar məcburən Azərbaycanımızın eləcə də, dünyanın bir çox yerlərinə səpələnmişdilər.

Daşkənd kəndinin Qəfərlilər məhəlləsindən başlayaraq Gözdülər məhəlləsinə – rəhmətlik Çoban kişi gilin evinə kimi kəndin uzunluğu yəqin ki, 2-3 km olardı. Və bu uzunluq boyunca demək olardı ki, kəndi qayalıq boya-boy iki yerə bölürdü. Kəndin bir hissəsi qayanın

üstündə, digər hissəsi isə qayanın altında geniş göy-çəmənlik sahədə yerləşirdi. Böyük sal-sal daşları olan qayalıqlar var idi, yəqin ki, bu daşlıqlara görə kəndin adını Daşkənd qoymuşdular. Qayalıqlar boyunca, qayalıqların qoynunda hardasa 8 böyük və 8-9 xırda zağa (qayaaltı mağara) var idi. Bu Zağalardan 4-ü daha məşhur idi. Biri Sulu zağa idi, o biriləri isə: rəhmətlik Sultanın zağası, rəhmətlik Məhəmmədin zağası və rəhmətlik Binnətin zağası. Birincisinə Məşədi Qasım zağası da deyirdilər. İçi su ilə dolu idi, ona görə də ora girmək mümkün deyildi. Digər üç zağada isə, toy məclisləri də keçirilirdi. Ən çox isə toy Məhəmmədin zağasında olurdu. Mən indi bu yazını yaza-yaza fikirləşirəm ki, görəsən dünyada yenə belə yer varmı ki, orda Daşkənddəki kimi zağlar olaydı və o zağlarda toy keçirəydilər, toyda da rahat 500 ətrafında adam iştirak edəydi? Rəhmətliklər – Dünyamalı, Qəhrəman əmim, Xıdır, Əli, Məcid, Zamaxan qara zurnada, çubuqla çalınan nağarada sümükləri oynadan havalar çalırdılar. Demək olar ki, hər oynayanın öz havası olardı, məclisi əlində çubuq "Toyun ağası" aparardı və heç kim onun bir sözünü iki eləməzdi.

İnsanlar axşam zağada keçirilən toya, ancaq oynamaq üçün gələrdi, daha camaatın oynadığı yerdə yemək olmazdı, yemək çadırlarda toydan əvvəl yeyilərdi, yemək olan yerdə aşıq, saz-söz ola bilərdi. Gəlin gətirəndə Şax aparardılar, atları çapardılar, atların

sinəsinə nəmərlər bağlayardılar, qara zurnanın, Xıdırın nağarasının sədaları altında atlar dal ayaqları üstə şahə qalxardı. Xıdır da çəkinmədən, nağaranı çala-çala şahə qalxmış atlara tərəf gedərdi, atları daha da coşdurardı.

...Rəhmətlik Qərib Abbasın su dəyirmanı işləyərdi, püştə ilə (dəyirmanın novuna suyu ötürən tikili) su gəlirdi, palıd taxtadan düzəldilmiş novla su sürətlə aşağı, dəyirmanın pərlərinin üstünə axırdı, pərlər dəyirman daşını fırladırdı, buğda üyüdülüb, una çevrilirdi. Sonralar Qərib Abbas qocaldı, rəhmətə getdi, o dəyirman dağıldı. Və biz uşaqlar dəyirmanın arxasındakı taxtadan düzəldilmiş hamar novla sürüşərdik və bundan böyük zövq alardıq.

...Məhərrəmlik ayında Seyid Bayram ocağında, rəhmətlik Bayram əminin təşkilatçılığı ilə məhərrəmlik keçirilirdi. 10 gün mərsiyyələr deyilirdi, şərbətlər paylanır, ehsanlar verilirdi. Rəhmətlik Qərib Abbas ələm gəzdirirdi, ələmə nəzirlər verirdilər. Məhərrəmlik gündə bir evdə keçirilirdi. Bayram əmi, İslam əmi, Aşıq Hacı, Firudin müəllim və başqaları çox şirin avazla mərsiyə deyirdilər. Məclisdəkilər əlləri ilə yüngülcə dizlərinə, sinələrinə vururdular. Mərasimin sonunda ehsan verilirdi. Məhərrəmliyin 10-cu günü qətl sınan günü idi. Demək olar ki, qətl sınan gün, bütün kənd camaatı yığışıb Həsən, Hüseyn adına deyilmiş mərsiyələrə ağlaşırdı.

Kənddə Molla Abuzər, Molla Həsən, Hacıməhəmmədli Abbasəli, Molla Əmirxan, Bəşir Abdullayev, İslam Hüseynov kimi Quranı dərindən bilən, dini təhsil görmüş mollalar, hörmətli ağsaqqallar olmuşdur...

...Qarabağdan, Azərbaycanın digər rayonlarından Seyid Bayramın qızı, rəhmətlik Seyid Maralgilə atlarla, dəvələrlə nəzirlər gətirərdilər. Və o dəvələri su dəyirmanının qabağındakı göy çəmənliyə hörükləyərdilər. Biz uşaqlar: "A dəvə, löh-löh balan məndədi", – deyib dəvələri qıcıqlandırardıq...

Eləcə də Seyid Yusif, Seyid İsmayıl ocağı olan Seyid Qələmgilə, Pəri nənəgilə qonşu kəndlərdən, Azərbaycanın rayonlarından qurbanlar gətirərdilər. Seyid Bayramın, Seyid İsmayılın günbəzlərinin üstündə qurbanlar kəsər, nəzirlər qoyardılar.

...İl boyunca, uşaqlar, eləcə də böyüklər Novruz bayramının gəlməsini səbirsizliklə gözləyərdilər. Xıdır Nəbidə qovurğa qovurub dəstərdən keçirər, qovut eləyərdilər. Qovut dolu qabı gecə evin kimsəsiz bir tərəfinə qoyurdular ki, Xıdır Elləz gələcək, qovutdan yeyəcək, əlinin izi qovutda qalacaq.

..."Kül-zibil" deyilən çərşənbədə yorğan-döşəkləri çölə tökərdilər, evdamını yığışdırardılar, rəngləyərdilər, pərdili palıd dirəkli tavana, ağ yumru izlər qoyardılar. Həyət bacanı, hər yanı tər-təmiz yığıb-yığışdırardılar.

..."Ölü təki" deyilən çərşənbə axşamında, o il ərzində kimin rəhmətə gedəni və ya başqa ehsanı var idisə, hərə bir kisə qənd alıb, kəndin mərkəzindəki küçə boyu düzülüb ehsan verərdilər və əsasən uşaqlar gedib o ehsanları alardılar. Axşam səmənidən halva çalardılar.

Axır çərşənbədə o il ərzində toyu olmuş gəlinləri tezdən gün çıxmamış çayın başına aparardılar, üstlərinə su çiləyərdilər, onlara aydınlıq, təmizlik, xoşbəxtlik arzulayardılar, hardasa, o gündən gəlinlərə qohum-əqrəba arasına çıxmaq hüququ verilirdi. Həmin gün "Sulaşma" günü olurdu, kim kimi bacardı, bir parç, hətta bir vedrə suya "qonaq eləyə", yəni başından o suyu tökə bilərdi. Və əlbəttə bundan heç kim inciyə bilməzdi. Qapı pusardılar. Bütün bu çərşənbələri əhatə edən günlərdə yumurta döyüşdürürdülər, yumurta helliyərdilər, çərşənbə axşamında göyə lopa yandırıb atırdılar, tonqalların üstündən hoppanırdılar. Bayram axşamı uşaqlar qapı-qapı gəzib (papaq atmaq yox idi) bayram payları alırdılar. Nədənsə hamı bayram payı olaraq yumurta almaq istəyirdi və hər kəs bayram axşamının sonunda daha çox yumurta yığmağı ilə fəxr edərdi. Hamı bir-biri ilə bayramlaşardı. Xüsusilə kirvələr bir-birilərinə çamadanda bayram payı aparardılar. Böyüklərə baş çəkib, onların bayramını təbrik edərdilər.

...Məhəllənin qadınları evlərdən birinə yığışıb, əriştə kəsərdilər, unlayardılar, sotun içində ip bağlayıb,

ipin altında süfrələr açıb, ipin üstünə əriştələri qurumağa sərərdilər. Biz uşaqlar da, əriştələri quşlardan, toyuq cücələrdən qoruyardıq. Ocaq qalayıb, sacın üstündə əriştələri qovurub, qışa hazırlıq görərdilər.

...Qış aylarında bol qar yağardı ki, 5-6 ay yerdə qalardı. Gündüzlər günəş yay aylarındakı kimi isti parlaq olurdu, adam gözünü açıb ətrafa baxa bilmirdi. Axşamlar şaxta düşürdü. Bu qarın üstündə "lıj" (ayaq xizəyi) sürməyin ləzzəti heç nə ilə əvəz oluna bilməzdi. İdman müəllimi rəhmətlik İsmayıl müəllimgildən, onun həyat yoldaşı, çox mehriban insan olan rəhmətlik Palina xaladan dövlət istehsalı olan lijlar götürüb, bəlkə də 2 saata əzab-əziyyətlə ayaqlarımızda lıjlar qalxırdıq Dəmyənin başına. Əzab-əziyyətlə qalxdığımız o boyda yolu 10-15 dəqiqəyə lıjla sürətlə aşağı enirdik. Sürətlə ayaqlaşa bilməyib yıxıldığımız vaxtlar da olurdu. Evdə bizi, xüsusilə də analarımız danlayardılar ki, dərsinizi oxuyun, avaralanmayın. Deyirdilər ki, bunlarda həvəsə baxın ki, soyuqda-qiyamətdə əlləri, ayaqları dona-dona 2-3 saata ağzı yuxarı zülm-zillətlə dağa dırmaşırlar ki, nədi-nədi bir neçə dəqiqəyə aşağı gələcəklər.

...Analar dağdan lijla enməyin ləzzətini, əlbəttə, heç vaxt duya bilməzdilər, bu siyahıda olanların əksəriyyətinə isə o xoşbəxtçilik nəsib olmuşdu.

...Yayın son aylarında, taxıl sünbüllərinin sütül vaxtı, sünbüllərdən qırpıb, dənləyib qovurardıq, ovxalayıb, üfürüb yeyərdik. Sütül, hələ özünü tutmamış

buğdanın qovurğası çox dadlı olurdu. Çətənəli qovurğa qovurardılar. Çöllərdə əkilən gülüllərdən, hələ bərkiməmiş, özünü tutmamış, sütül-sütül dənləyib yeyərdik, lalə toplayardıq, südü əlimizi paltarımızı qaraldardı, tozlu dənələrini südlə qarışdırıb içərdik. Şoşan, yemlik, quzuqulağı yığardıq və yedikcə dadından doymazdıq. Yeri şumlayan traktorun kotanının ardınca düşüb qoçquzu toplayıb yeyərdik. Bir mayda özümüzlə yemək götürüb Şəhər dərəsindəki və ya başqa bir bulağın başına çıxardıq. Göy çəmənlikdən sarıçiçək, nərgizgülü, bənövşə yığıb dəstələyər, evə gətirərdik. O çiçəklərin ətri bütün evi bürüyərdi.

Yayın əvvəlində quşəppəyindən, gicitkandan kətə, xəmir yaymasından qat-qat fəsəli bişirərdilər. Soyuq qış aylarında qurutlu, çolpalı xəngəl, qaşıq xəngəli, əvəlikli isti, xaşıl, cılfır bişirərdilər. Hər kəsin evində olan təndirdə çörək bişəndə, çörəyin xoş ətri hər yana yayılardı. Təndir yanıb közə düşəndə yumurtanı suya salıb atırdıq közün üstünə, yumurta kabab kimi bişər, bir tərəfi də partlayardı, qabığını təmizləyib, lavaşın arasına qoyub, duzlayıb ləzzətlə yeyərdik.

Təndirdə çörək bişib qurtarandan sonra, tavada təmizlənmiş qoyun baş-ayağı qoyulurdu, o baş-ayaq səhərə kimi təndirdə asta-asta bişirdi. İstisi qalmış təndirə kürsü edib ayaqlarımızı təndirə sallayırdıq, danışılan nağıllara qulaq asırdıq.

Xüsusi ilə qış aylarında, Göyçə gölünün balığı bol olurdu. Balığı doğrayıb, yarım stəkan su atıb, demək olar ki, buğda bişirərdilər. Bir az soyumağa qoyandan sonra, yedikcə doymaq olmurdu. Çayın qırağı boyunca bitən nallıcanı yığıb dolma bükərdilər və o nallıcanın çox ətirli, dadlı dolması olardı.

...Növbə ilə mal-qoyun sırasına gedilərdi. Özümüzlə qatıq, pendir, soyutma yumurta, təndir çörəyi götürərdik, bulaqların başında onları ləzzətlə yeyərdik.

...Uşaqlar çiling ağac, dirədöymə, kəndi ikiyə bölən qayalıqlarda tüfəng-tüfəng, bayraq götürüb qaçdı, löpük-löpük, həvə-həvə, futbol, voleybol oynayardılar.

...Basma tökülərdi, bərkimiş basmadan kərmələr, qoyunun yatdığı yerdən sarmalar kəsilərdi. Kəsilmiş, qurumuş kərmələrdən, sarmalardan qalaxlar qurulardı. Qalağın üstünə yappalar yapılardı, qalağın içinə "şaşkılar" doldurulardı ki, həm qış gələndə sobada, həm də çörək bişirəndə təndirdə yandırılsın.

...Ot biçini vaxtı, kişilər kərəntilərini götürüb, örüşlərə ot biçininə gedirdilər. Durna qatarı kimi cərgəyə düzülüb, biçənəklərdə göy ot biçirdilər, ot lay-lay yerə sərilirdi, günəşin altında quruyurdu, sonra biçilən otları qadınlar, qızlar dırmıqlarla, yeniyetmə oğlanlar isə, yaba ilə yığıb toplayırdılar, xotmalıyırdılar. Dirgana gedən cavan oğlanlar, kişilər isə, bortları açılmış "QAZ-52", "QAZ-53" maşınlarına yükləyib, kəndirlə möhkəm

bağlayıb aparardılar kənddəki ot tayalarına vurmağa; qışda mal-qara üçün hazırlıq görürdülər.

...Kombaynlarla taxıl biçilirdi, kombaynın bunkerinə yığılan taxıl maşınlara vurulub, kənddəki anbarlara, taxılın saman hissəsi isə preslənib, yenə maşınlara vurulub, kənddəki taylara yığılmağa aparılırdı.

...Tütün şitilləri parniklərdə sulanıb, gübrələnib böyüdülürdü, sonra o şitillər torpağa köçürülürdü. Sulanıb, gübrələnirdi. Böyümüş tütün yarpaqları növbə ilə iynələrə, iynələrdən ipli tellərə düzülürdü, qurudulurdu, taylar formasında preslənib, maşınlara yığılıb, rayon mərkəzinə aparılıb təhvil verilirdi.

...Uzun qış gecələrində növbə ilə böyüklər bir evə yığışır, olub-keçənlərdən danışırdılar. Rəhmətlik Aşıq Hacı nağıllar, qərəvəllilər danışardı, Xəvərzəmin oxunurdu. Biz uşaqlar, bu gecələri çox səbirsizliklə gözləyirdik. Taxtın ayağının dibində oturub danışılan söhbətlərə, əhvalatlara, nağıllara diqqət kəsilərdik və bütün bunlar bizdən asılı olmayaraq sonrakı yaşayacağımız illər üçün yaddaşımıza hopurdu.

...Çınqılda açıq, üzdə olan daşxanalardan pulsuz-parasız maşınlarla daş yığıb, gətirib ev tikirdilər. Ev tikəndə qohum-əqrəba yığışıb ona axıra kimi kömək eləyərdi. Bircə ustaya pul verilirdi.

...Valideynlər uşaqların oxuması ilə fəxr edirdilər. Söhbətləri tez-tez uşaqların necə oxumaları haqqında olardı. Göyçədən, Daşkənddən çıxan məşhur adamla-

rın adlarını çəkib misallar gətirərdilər ki, oxuyun, siz də onlar kimi olun. Bir-birindən dəyərli, bilikli, yaxşı dərs keçən müəllimlər var idi. Rəhmətliklər – Tanrıverdi müəllim, Tapdıq müəllim, Dünyamalı müəllim, Namaz müəllim, Zeynalabdin müəllim, Səfxan müəllim, Mehdi müəllim, Zeynalov Xasay müəllim, köçkünlük yaşayan – Mürsəlov Xasay müəllim, Qoşunəli müəllim, Şahbaz müəllim, İsgəndər müəllim, Alqayıt müəllim, Sürəddin müəllim, Maksim müəllim, Oruc müəllim, Arif müəllim, Rasim müəllim, bizim ilk sinif müəllimimiz olan rəhmətlik Mamed müəllim və ümumiyyətlə, bütün digər müəllimlərin hamısı...

...Və sonda... bu kitabda Göyçə mahalı Daşkənd kəndindən 1988-ci ilin noyabrında erməni təcavüzkarları və onların havadarları tərəfindən məcburi surətdə didərgin salınmış, Bakı şəhərində, Azərbaycanımızın digər şəhər və rayonlarında, xarici ölkələrdə yaşayan daşkəndlilərin, o cümlədən 1948-1953-cü illərdə kənddən deportasiya olunmuş, Bərdə rayonundakı Yeni Daşkənd kəndində məskunlaşmış ailə başçılarının tam olmayan siyahısı verilib. Bu siyahıda Daşkənddən olan 1771 ailə başçısının adı yazılıb, hər ailəni ən azı 5 nəfərdən saysaq, bu gün Azərbaycanımızda və xarici ölkələrdə yaşayan Daşkəndlilərin sayı 8855 nəfər olar.

İstər-istəməz hər yana səpələnmiş həmkəndlilərimizin tam siyahısını tərtib etmək mümkün olmadığından siyahıdan kənarda qalanları da nəzərə alsaq, yəqin

ki, daşkəndlilərin sayı 10.000 (on min) nəfəri ötüb keçər.

Əlbəttə, daşkəndlilər öz doğma dədə-baba kəndlərində yaşasaydılar, bu kitabın, siyahının yazılmasına, bir belə xırdalıqlara varılan ön söz yazmağa bəlkə də, ehtiyac olmazdı. Daşkəndimizi hələ ki itirdiyimizdən (qismət olsun, qaytaraq) qoy, bu kitab, onları birləşdirən, bir-birləri ilə əlaqə qurmağa yardımçı olan, bir-biriləri ilə hal-əhval tutmağa kömək edən, onminlik daşkəndlinin stolüstü kitabı olsun. Bizdən sonra gələn nəsil bu kitabı vərəqləyə-vərəqləyə dədə-baba yurdlarını unutmasın. Bir neçə on illərdən sonra iyirmiminlik və daha artıq daşkəndlinin siyahısını tərtib edəcək bir daşkəndlimizə yardımçı kitab olsun. Onları bir kəndə, bir bölgəyə toplaşıb, yeni yaşayış məskənləri salmağa səsləyən kitab olsun.

...Və nəhayət, onları valideynlərimizin, qohum-əqrəbalarımızın, əcdadlarımızın ruhu dolaşan, qəbirləri olan Göyçə mahalında, Daşkənd kəndində yenidən toplayan bir kitab olsun.

*"Daşkənd və daşkəndlilər" kitabı,*
*Bakı: Hərbi Nəşriyyat, 2012*

## BİZ ERMƏNİLƏRƏ NƏ VAXT QALİB GƏLƏCƏYİK?

Biz gərək papağımızı qabağımıza qoyub bir yaxşı-yaxşı fikirləşək: – Bu nə deməkdir? Ermənilər bizdən daha nə istəyirlər?

Onlar artıq 30 ilə yaxındır ki, Xankəndi paytaxt olmaqla Dağlıq Qarabağı, Şuşanı, Kəlbəcəri, Laçını, Qubadlını, Ağdamı, Füzulini, Zəngilanı, Cəbrayılı işğal ediblər. Ermənistan adlanan ölkə Qərbi Azərbaycandan soydaşlarımızı dədə-baba torpaqlarından didərgin salıb, mal-mülklərinə sahib çıxıblar. Bütün bunlardan sonra, indi də Tovuzu işğal etmək istəyirlər.

Ağstafa, Qazax, Naxçıvanı gülləbaran edirlər. Ermənilər görünür öz xəstə məntiqləri ilə fikirləşirlər ki, Azərbaycanın Dağlıq Qarabağdan başqa yeddi rayonunu işğal etmişik, səkkizincini, doqquzuncunu niyə işğal etməyək?

Azərbaycanın yeddi rayonunu işğal edəndə bizə neylədilər ki, növbəti rayonlarını da işğal edəndə nəysə edələr?

Bunların fikiri nədir? Belə görünür fikirləri bizi bütünlükdə bu torpaqlardan silib-süpürüb, təmizləməkdi. Bütün bunların müqabilində baş verən təsəvvür olun-

maz erməni həyasızlığının qarşısında biz nə etməliyik, nə qədər dözməliyik?

Görünən odur ki, biz susduqca dünyanın çeşidli təşkilatlarına, ATƏT-ə güvəndikcə, onların havadarlarından ehtiyat etdikcə, ermənilərin yeni-yeni planları ortaya çıxır, iştahları get-gedə artır.

Axı müqayisə edəndə biz bütün sahələr üzrə ermənilərdən üstünük; sayca ermənilərdən dəfələrlə çoxuq, iqtisadi cəhətdən ermənilərdən dəfələrlə güclüyük, maddi-texniki bazamız daha üstündü, daha müasir silah-sursata malikik.

Yer üzündə yaşayan azərbaycanlıların sayı 50 milyondan artıqdı, ÜDM-iz, dövlət büdcəmiz, hərbi büdcəmiz dəfələrlə onlarınkından çoxdu. Ermənistanı əhatə edən İranda 35 milyon ətrafında, Gürcüstanda 500 min dən artıq soydaşlarımız yaşayırlar. Bir qonşusu bizə qardaş olan 83 milyonluq dünyada söz sahibi olan qüdrətli Türkiyə dövlətidi. Təbii ehtiyyatlarla çox zəngin olan dövlətimiz, Xəzər dənizimiz var.

Və qarşımızda duran hardasa 2,5 milyonluq əhalisi olan, təbiəti dağdan, dərədən, daşlıqlardan ibarət olan, təbii ehtiyatlardan demək olar ki, məhrum Ermənistan adlanan dövlətcik. Yer üzündə yaşayan ermənilərin sayı 7 milyon ətrafında ola ya olmaya.

Bizim bu göstəricilərimiz erməni tərəfində olsaydı, yəqin bizi çoxdan yer üzündən silmişdilər.

Dünya var olandan bəri hələ olmayıb ki, erməni deyilən millət hansısa müharibəni udsun və ya hansısa dövlətin torpağını işğal etsin.

İndi, belə çıxır ki, tarix boyunca dünyada ən aciz millət bizik?

Bunlar bizim üstümüzdə tarixə yeni səhifə yazmaq istəyirlər?

Bu təsəvvür olunmaz biabırçılığı, əlbəttə, biz üstümüzə götürə bilmərik və götürməyəcəyik!

Bu harınlamış, çaşmış, özlərindən tarixləri ilə bağlı fantaziyalar uyduran millətin cavabı necə lazımdır verliməlidir.

Biz bir millət olaraq, dövlət olaraq gücümüzü onlara göstərməliyik. Ermənilərin yerinin harda olduğunu onlara başa salmalıyıq.

Bu Dövlətimiz, Millətimiz üçün şərəf, namus məsələsidi.

Və bu yolda açıq-aydın görünür ki, millətimizin hər bir nümayəndəsi erməni ilə savaşmağa, əlindən gələn digər hər bir yardımı etməyə hazırdılar.

Bizim istəmədiyimiz, məcburən ermənilər tərəfindən, müqəddəs savaşa çəkildiyimiz yolda Tanrı Millətimizə, Dövlətimizə yar olsun!

*goyce.az*
*20.07.2020*

# TÜRKİYƏNİN "ÇİNAR"LI GÜNLƏRİ

"Tufaq" turizm və folklor araşdırma cəmiyyəti "Turalfilm"ə dəvətnamə göndərərək, onu özünün təşkil etdiyi 7-ci Beynəlxalq folklor festivalına dəvət etmişdi. Bu festival sayından məlum olduğu kimi, artıq 7-ci dəfə Türkiyənin məşhur kurort şəhərlərindən biri olan İstanbulla onu 40 dəqiqəlik dəniz yolu ayıran Mərmərə dənizinin sahili boyunca yerləşən gözəl Yalova şəhərində keçirilidi. Həmişə bu festivalda 10-dan 20-yə qədər dövlətlərin nümayəndələri iştirak edirdi.

Mən hələ festivaldan qabaq İstanbulda olanda, "Tufaq"ın rəhbərliyi ilə görüşüb, Azərbaycanın müstəqilliyə qədəm qoduğu bir vaxtda beynəlxalq tədbirlərdə onun iştirakının vacibliyini söyləmişdim və az vaxt keçəndən sonra, "Tufaq" tərəfindən belə bir dəvəti almışdıq. Bu festivalda hamımız istəmişdik ki, Azərbaycanı Əminə xanım Dilbazinin rəhbərlik etdiyi "Çinar" xalq rəqs kollektivi təmsil etsin. İstəyimizi Əminə xanıma bildirəndə məmnuniyyətlə razılığını bildirmişdi.

...Qatarla sentyabrın 6-da Kiyevə getdik, sentyabrın 8-də oraya çatdıq. Üç gün Kiyevdə qalmalı olduq. O üç

gündə Ukrayna Beynəlxalq Əlaqələr İnistitutunun tələbələri Zaur Göyçəgöl, Vurğun Zakiroğlu, Təbrik bəy mehmanxanada yerləşməyimizdən tutmuş, bütün işlərdə bizə yardımçı oldular. Onlarınköməkliyi ilə kirayə etdiyimiz avtobusla Ukraynadan Türkiyəyə yola düşdük.

...Ölkələr bir-bir arxada qalırdı: Ukraynanı Rumıniya, Rumıniyanı Bolqarıstan, Bolqarıstanı Türkiyə əvəz edirdi. Rumınya-Bolqarıstan sərhədlərində: həm giriş, həm çıxışda rüşvət baş alıb gedir, çəkinmədən dollar istəyir, siqaret, araq, qəhvə, şampan tələb edirdilər. Türkiyəyə girəndə isə o dəqiqə hiss olunurdu ki, başqa dünyaya düşmüsən. Türkiyədəki səliqə-səhman, reklamlar, insanların davranışı, münasibəti adama çox şeyi deyirdi. Orada birinci qabağımıza çıxan Əli Şəntürk adlı türk sərhədçisi oldu.

Azərbaycandan olduğumuzu, həm də festivala getdiyimizi biləndə ərklə bildirdi ki, çalıb-oynamasanız sizi buraxdı yoxdu. Məlum oldu ki, 1923-cü ildə Gəncədən gələnlərdəndi. Özü də 10 ildən çox rəqslə məşğul olub.

Sərhəddə yarım saata kimi konsert verdik. Avropadan gələn avtobusların sərnişinləri də qoşuldular bizə, başladılar rəqs etməyə. Bütün yorğunluğumuz canımızdan çıxdı. Ətafdakıların xoş əhval ruhiyyəsi bizə də sirayət etdi. Əli bəy sərhəddə lazım olan bütün

sənədləri tez hazırladı, haralara getmək lazım olduğunu göstərdi, bizi yola saldı.

Türkiyənin gözəl mənzərələrini bənzərsiz, ucsuz-bucaqsız, səliqə səhmanlı İstanbulu arxada qoyub, Mərmərə dənizini adlayaraq Yalovaya çatdıq. Festivala iki gün gecikmişdik. Bizi çox yaxşı qarşıladılar, gəlişimizə çox sevindilər. "Tufaq"ın prezidenti Birol Aslan bizi salamladı, festival haqqında fikirini açıqladı. Bizim qrupa təhkim olunan Yaşar bəy və Rəcəb həmişə qulluğumuzda hazır idilər.

Axşamdan bildirdilər ki, birinci konsertimiz sabah Orxan-Qazi şəhərində olacaq. Bizdən başqa festivalda 12 dövlət iştirak edirdi. Bolqarıstan, Ukrayna, Rumıniya, Finlandiya, Litva, Makedoniya, Kipr, İsveç, Polşa, Yunanıstan, Latviya, bir də Türkiyə. Gələnlər Mərmərə dənizinin sahilində iki beşmərtəbəli mehmanxanada yerləşmişdilər. Hər qrup konsert vermədiyi boş vaxtlarında mehmanxanada, meydançada mahnılar oxuyur, səhnəciklər göstərirdilər. Sabahısı günü günorta yeməyindən əvvəl biz Azərbaycan toyu göstərdik. Saz çalan Xəlili "evləndirdik". Xonça ilə gəlini gəlin, bəyi bəy paltarında, bəyin sağ-soldişi, bəyin, gəlinin ata-anası, qardaş-bacısı hamısı müvafiq geyimləri ilə "Vağzalı" havası altında gəlini üçüncü mərtəbədən düşürtdük. Əminə xanımın başçılığı ilə Azərbaycan toyunda lazım olan bütün adət və ənənələrə əməl edərək, aşağı

meydançada çalıb oynadıq. Bütün mehmanxanadakılar yığışmışdılar "Çinar"ın başına. Çoxları elə zənn etmişdilər ki, bu əsl toydur. Sonrakı günlər mehmanxanada Xəlilə iki qat yemək verirdilər ki, bəy çox yeməlidir.

O gündən sonra biz həmişə diqqət mərkəzində olduq.

Orxan-Qazidə bizdən başqa Ruminya, Bolqarıstan, Ukrayna və Finlandiya qrupları da iştirak edirdilər. Azərbaycanın adı çəkiləndə alqış sədaları hər yanı bürüyürdü. Konsertlər Orxan-Qazinin mərkəzi meydanında keçirilidi, bütün meydan insan seli ilə dolmuşdu. Şəhərin bələdiyyə rəisi və başqa dövlət adamları oturmuşdular.

Proqramı "Vağzalı-Mirzəyi" rəqsi ilə başladı. Qızlar səhnəyə çıxanda bir daha alqış sədaları hər yanı bürüdü. Onların zərifliyi, milliliyi, çıxış etdiyimiz bütün şəhərlərdə tamaşaçıları valeh etdi. "Vağzalı-Mirzəyi" də Xatirənin rəqslərini, "Sarı gəlin"də Cəmilənin, "Tərkəmə"də Ülviyyənin, "Dostluq", "Dolayı", "Yallı" rəqslərində Mədinənin, Xatirənin, Səidənin, İlhamənin, ümumiyyətlə, qızların hamısının oyun məharətini görəndən sonra heyranlıqla bildirdilər ki, biz Azərbaycanı bu cür təsəvvür etmirdik. Yalovadan olan tanınmış doktor Semi söyləyirdi ki, siz mənim Azərbaycan haqqında olan fikirimi tam dəyişdiniz. Təkcə rəqslərə, Alimin muğamatına, Xəlilin sazına, Nadirin

nağarasına, Əminə xanımın tamaşaçılarla ünsiyyətinə baxdıqdan sonra bu qənaətə gəldim ki, Azərbaycan incəsənətdə çox qabaqda imiş. Öz heyranlıqlarını finlər də, polşalılar da, isveçlilər də bildirirdilər. Və bu dövlətlərin nümayəndələrinin hamısı bizi öz ölkələrində keşiriləcək festivala dəvət edirdilər.

Birinci konsertimizdən sonra "Tufaq"ın təşkilatçıları camaatın bizi səhnədən buraxmaq istəmədiklərini görüb, çalışırdılar ki, bizim çıxışımızı axıra saxlasınlar. O biri qrupların da çıxışlarına imkan yaransın, camaat dağılmasın. Yalovada 30 dəqiqəlik çıxış əvəzinə, bir saat yarım bizi səhnədən buraxmadılar. Qısa vaxt ərzində bütün yalovalılar və başqa şəhərlərin sakinləri Əminə xanımı tanıdılar, sevdilər. Alimin oxuduğu mahnılar altında tamaşaçılar Əminə xanımla, qızlarla birgə rəqs etdilər, neçələri Xəlilin sazının altında ağladı.

Festival keçiriləcək şəhərlərdə radio ilə elan veriləndə deyirdilər ki, hamınızı axşam mərkəzi meydanda Azərbaycan və başqa dövlətlərin iştirakı ilə keçiriləcək rəqs festivalına dəvət edirik. Konsert qurtarandan sonra da bizi buraxmaq istəmirdilər. Qarabağa aid saysız-hesabsız suallar verirdilər, bizimlə şəkillər çəkdirirdilər.

Hələ qabaqlardan tanıdığımız dostalarımız "Evciplast" fabrikinin sahibi Rəcəb bəy Evci, inşaat firmasının müdiri Kənan bəy Baş, böyük bir mağazanın sahibi Nail Keçici, doktor Semi ilə axşam bizim otaqda Əminə

xanımın Bakıdan gətirdiyi samovarda hazırlanmış çayın ətarfına toplaşırdıq. Əminə xanımın paxlavasının, şəkərburasının, mürəbbələrinin qonağı olurduq. Gecə yarısına kimi söhbətlər uzanıb gedirdi. Qarabağdakı vəziyyətlə maraqlanırdılar. Heç kim Alimin mahnılarından, Xəlilin sazından ayrılmaq istəmirdi. Əminə xanım Xəlilin sazına qulaq asa-asa keçmişi çözələyirdi. Belə fikirə gəldim ki, saz havası altında hökmən rəqs havası hazırlayacağam. Artıq o rəqs ürəyimdə yaranmağa başladı.

Sentyabrın 16-sında saat 15-də Qara Mürsəldə, saat 19-da Yalovada, sentyabrın 17-sində Aksa fabrikində, Altunobada çıxış etdik. Axşam isə "Azərbaycan günü" keçirdik. Yenə adlarını çəkdiyimiz şəhərlərdə görüşlərimiz əsl sənət bayramına çevrildi. Mən bu görüşlərdən ikisini – Aksa fabrikindəki görüş və "Azərbaycan günü" haqqında bir-iki kəlmə demək istərdim.

Aksa fabriki Avropada olan üç ən böyük fabriklərdən biridir. Fabrikin sahibi Türkiyənin ən zəngin adamlarındandır. Fabrik kimyəvi maddələrdən sintetik iplər, materiallar istehsal edir. Dedikləri kimi heç bir reklama ehtiyacları yoxdur. Sifarişləri 6 ay, bir il öncədən verilir. İstehsal etdikləri məhsullar əsasən Avropa ölkələrinə göndərilir. Fabrikdə üç minə yaxın işçi çalışır, həyətinə girəndə ordakı səliqə-səhmana, yaşıllığa, insanların bir-birinə münasibətinə heyran qaldıq.

Bizdən başqa fabrik işçiləri ilə görüşə finlandiyalılar da gəlmişdi.

Aksa fabriki "Tufaq"ın keçirdiyi festivalın əsas sponsuru idi. Finlandiya qrupundan sonra biz çıxış etdik. "Çinar"ın çıxışını maraqla qarşıladılar.

Axşam da qaldığımız mehmanxananın qabağındakı konsert salonunda "Azərbaycan günü" keçirdik. Hər bir ölkə burada öz gününü keçirirdi. Bu zaman onlar öz mahnı və rəqslərini nümayiş etdirir, rəqslərini başqa ölkədən olan nümayəndələrə öyrədirdilər, zalda oturanlara şirniyyat paylayırdılar, hədiyyələr verirdilər.

Bizim musiqi, rəqs, yumor zənginliyimizə, dostlarımız Kənan və Rəcəb bəyin köməkliyi ilə başqa dövlətlərin nümayəndələrinə paylamağa püstə, fındıq, badam, ceviz, rakı, alma-armud zənginliyi ilə əlavə olumuşdu. "Azərbaycan günü" öz məzmunu, rəngarəngliyi ilə hamının yaddaşına da həkk olundu.

Sentyabrın 18-də Bursada olduq. Proqram üzrə hər axşam olduğu kimi Yalovada çıxışımız olmalı idi. Lakin hələ dünəndən Bozqurdların Yalovadakı "Ocaq" cəmiyyətindən gəlib bildirmişdilər ki, Alparslan Türkeş İzmitə gəlir, bu münasibətlə qapalı idman zalında böyük konsert olacaq. Xahiş etmişdilər ki, biz də həmin konsertdə çıxış edək. Kollektivimiz bu təklifə məmnuniyyətlə razılığını bildirdi. Yalovada yaşayan Qars

Azəri türkləri bilirdilər ki, litseyin qapalı idman zalını kirayələyiblər.

Burada konsert qurtarandan sonra birbaşa İzmitə gedə bilmədik. Məlum oldu ki, rəqslərə uyğun kostumların hamısı götürülməyib. Bir də qayıtdıq Yalovaya, kostumlarları götürüb İzmitə yola düşdük. Biz gəlib konsert verilən saraya çatanda artıq saat 22 idi. Deyilənə görə 10 minə yaxın tamaşaçı var idi. Salona daxil olanda hamı "Azərbaycan", "Azərbaycan" deyirdi. Zalda bayraqlarımız dalğalanırdı. Alimin mahnıları, qızların rəqsləri altında "Azərbaycan Vətənimiz, Qarabağ Ürəyimiz!" sədaları, "Azərbaycan kəlməsinin əzəmətini ancaq Azadlıq meydanının ən qızğın vaxtındakı səslərin gurluğu, çılğınlığı ilə müqayisə etmək olardı. Təəssüf ki, Türkeş yarım saat da artıq bizi gözləyib getmişdi. Çox hayıf ki, Türk dünyasının böyük oğlu Alparslan Türkeşlə görüşə bilmədik.

Sentyabrın 19-da yenidən Orxan-Qazidə, Yalovada çıxış etdik. Yalovada konsertdən sonra Bozqurdların "Ocaq" cəmiyyətinin rəhbərləti ilə görüşdük. Qarabağla əlaqədar çoxlu suallar verirdilər, öz fəaliyyətləri haqqında danışırdılar. Onu xüsusi ilə qeyd edirdilər ki, xaricdəki türklərin səsinə həmişə birinci Bozqurdlar səs verib. Kommunizmin Türkiyədə eksport olmasına məhz Bozqurdlar mane olub. Axırda bizə nişanlar, plakatlar, kitablar hədiyyə etdilər. Həmin gecə festivalın

bitdiyi gün idi. Bu son gecədə həm də qızlar arasında gözəllik müsabiqəsi keçirilirdi. "Tufaq" qrupların rəhbərlərinə hədiyyələrini verirdi. Ertəsi gün artıq qrupların demək olar ki, yarısı yola düşdü. Bizim isə hələ dediyim kimi, Yalovada yaşayan qarslı Azəri türklərinin köməyi sayəsində, xüsusi ilə cavan, enerjili, mehriban Uğur bəyin, "Xəzər" eksport-import firmasının prezidenti Lətif bəyin böyük köməkliyi ilə sentyabrın 20-də litseyin qapalı idman zalında konsertimiz olacaqdı. Axşama kimi boş olan vaxtımızda məşhur istirahət bölgəsi olan Termala getdik. Termal türk xalqının böyük oğlu Atatürkün ən çox sevdiyi yerlərdən biri imiş. Termalın göz oxşayan mənzərələrinə tamaşa etdik, yerdən çıxan isti suyun başında olduq, piyada ağaclıqda, təpəciklərdə dolaşdıq. Zala daxil olanda alqışlar qopdu. "Azərbaycan", "Qarabağ" sözləri salonu bürüdü və bu səda altında konsertimizi Alimin "Qarabağ" mahnısı ilə başladıq. Alimin mahnısını rəqslər əvəz etdi, rəqsləri saz, sazı orada yaşayan Azəri türklərinin ürək sözləri. Elə konsert gedə-gedə, vaxt aşırı salondan adamlar gəlib, Əminə xanımla, bizlərlə görüşürdülər, evlərinə dəvət edirdilər. Qarabağ haqqında yenə suallar verirdilər. Kamal Afət adlı yaşlı bir kişi əlində çanta mənə yaxınlaşdı. Çantanı verib dedi ki, burda bir xalça var, bir də rəsmdir. Kərbəladan gətirmişəm, bunu aparıb Azərbaycandakı məscidlərin birinə hədiyyə verərsiniz.

Konsertimiz davam edirdi. Oturanlar arasında sevincindən ağlayanlar da var idi, həsədlə baxan da, "Bravo, bravo" deyib qışqıran da, zalda qol götürüb oynayan da. Üç saat çıxış etdik və çıxışımız başdan ayağa video ilə çəkildi.

...Ertəsi günü bizi yola salmağa, bütün dostlarımız, tanışlar, Azəri türkləri toplaşmışdılar. Festival müddətində bir-birimizə elə qaynayıb-qarışmışdıq ki, göz yaşlarsız ayrılıq mümkün deyildi. Arxamızca su atdılar. Uğur bəylə, Acar bəy İstanbuldan çıxana kimi bizimlə gəlib yolu göstərdilər və sonra məhəbbətlə bizdən ayrıldılar.

...Yenə yollar. Hamı susur, dinib-danışan yox. Hər kəs çəkilmişdi öz içinə... Bu həzinliyi, sevinci, qəmi-həsrəti hamı təkcə canından keçirmək istəyirdi.

"Çinar" Türkiyədə keçirilən Beynəlxalq festivalda öz iştirakı ilə hər kəsin qəlbinə "Azərbaycan" adlı yeni bir işıq saldı. Onlar "Çinar"lı Azərbaycanı həmişə xatirələrlə xatırlayacaqlar.

*"Ədəbiyyat və incəsənət" qəzeti,*
*1992-ci il*

# TÜRKİYƏDƏ AZƏRBAYCANI LAYİQİNCƏ TƏMSİL EDƏN HƏKİM

"Çinar" xalq rəqs ansamblı İzmir valiliyinin və "Türk ocağı"nın dəvəti ilə sentiyabrın 1-dən oktyabırın 15-ə kimi Ege bölgəsinin Qurtuluş bayramında iştirak edirdi. "Çinar"ın bu səfəri haqında televiziyada verliş gedib, qəzetlərdə yazılar verilib. Mən bu yazımda səfər müddətində, İzmirdə işləyən, İlizarov üsulu ilə sümük sınıqlarını və sümüklə bağlı digər xəstəlikləri müalicə edən, Türkiyədə çox məhşur olan həmyerlimiz Cəbrayıl Ələkbərov haqqında danışmaq istəyirəm.

İzmirdə, böyük şəhər bələdiyyəsi Cəlal Atiq adına qapalı idman sarayında konsert verirdik. Konserti çox müvəffəqiyyətlə qurtardıq. Konsertdən sonra, gözəl konsert üçün bizlərə yaxınlaşıb minnətdarlıqlarını bildirdilər. Və bu minnətdarlıq eləyənlərdən biri də Cəbrayıl Ələkbərov idi. Cəbrayıl həkim konsertdən sonsuz dərəcədə məmnun idi. Deyirdi ki, siz göstərdiyiniz rəqslərlə, oxuduğunuz mahnılarla burada yaşayan, işləyən, oxuyan biz Azərbaycanlıların başını uca etdiniz, hörmətimizi göylərə qaldırdınız. Cəbrayıl həkim özü haqqında məlumat verərək bildirdi ki, Masallı rayonun

Qızılağac kəndində anadan olub. Orta məktəbi və musiqi məktəbini Masallıda bitirib. 1978-ci ildə Vladivastok Dövlət İnstitutunun Müalicə proflaktika fakültəsinə daxil olub. 1985-ci ildən 1991-ci ilə kimi Kurqanda, dünya şöhrətli həmyerlimiz İlizarovun yanında işləyib. Kurqanda işlərinin çox yaxşı olmasına baxmayaraq, müharibə gedən Azərbaycanda lazım olduğunu başa düşüb, 1991-ci ilin avqustunda vətəninə gəlib. 1991-ci ilin noyabrına kimi Səhiyyə Nazirliyində get-gələ salırlar. 1991-ci ilin noyabrında akademik Cavadzadənin köməkliyi ilə Azərbaycan Dövlət həkimləri Təkmilləşdirmə İnstitutunda işə düzəlir. Bakıda işlədiyi müddətdə Türkiyədə türk travmatoloqların toplantısına dəvət olunur. 20 günün içində İlizarov metodu ilə 12-dən çox cərrahiyyə əməliyyatı aparır. 1993-cü ilin mayında Türkiyənin Nov şəhərində keçirilən ümümdünya travmatoloqlarının 12-ci konfıransına dəvət olunur. Bu dəfə də, bir neçə əməliyyat aparır. Həmin ilin oktyabrın 18-də Türk-İtaliya travmatoloqları konqresinə dəvət olunur. Bu beynəlxalq toplantılara, konfranslara Cəbrayıl həkim çox çətinliklə, şəxsi əlaqələrlə tanıdığı sponsorların köməyi ilə gedir. Deyirdi ki, mən Kurqandan gələndə bilirdim ki, Azərbaycanda çətinliklərlə qarşılaşacağam, elə fikirləşirdim ki, bütün çətinliklərə dözərəm. Amma dözə bilmədim.

Allah eləməsin, mən Azərbaycandan inciyib küsə bilmərəm. Çətinlikləri doğma Azərbaycanım yaratmır.

Rüşvəti də Azərbaycan almır. Ayrı-Ayrı adamlar alırlar. Və dərinə gedəndə o adamlarda da mən günah görmürəm. Türkiyədə həkimlər niyə rüşvət almırlar? Guya Türkiyə həkimləri bizimkilərdən daha vicdanlıdırlar, daha vətənpərvərdilər? Yox! Vallah yox! Türkiyədə ona görə rüşvət almırlar ki, rüşvət almaq hər şeydən əvvəl onların özlərinə sərf etmir. Məhz dövlət səviyyəsində sistem elə qurulub ki, rüşvət almaqla həkim bütün həyatını puç eliyə bilər. Ona görə həkimlər heç o haqda fikirləşmirlər, risq eləyib rüşvət də almırlar. Yoxsa nə bilim, daha çox vətənpərvər olduqlarına görə, daha çox millətlərini sevdiklərinə görə yox. Bizim həkimləri pis yola sürükləyən məhz səhiyyə sisteminin düzgün qurulmamasıdır. O da ki, bir günün iki günün işi deyil.

Türkiyədən dəfələrlə aldığı dəvətlərin birinə axır ki, razılığını bildirir. 1993-cü ilin axırlarında İzmir şəhərinə işləməyə gəlir. 9 Eylül Universitetində kontraktla işləməyə başlayır.

Cəbrayıl həkim Türkiyədə heç bir ili tamam olmayan fəaliyyəti, dövründə, demək olar ki, Türkiyənin bütün həkimləri arasında tanınır. Qəzetlər onun haqqında dəfələrlə məqalələr verib. Beynəlxalq konfrasların iştirakçısı olub.

Məsələn, 1994-cü il “Xəbərlər” qəzeti “SSK-da Azəri Doktor Ələkbərovun uyğuladığı İlizator yöntəmi ilə boy da uzadılır” başlığı ilə Cəbrayıl doktor haqqında

yazır. Məqalədə Cəbrayıl həkimin bud sümüyündə cərrahiyyə əməliyyatı aparıb sümüyü 18 sm artırmasından danışılır.

Türkiyədə tanınmış travmotoloq həkimləri öyrənmək məqsədilə Cəbrayıl həkimin apardığı cərahiyyə əməliyyatlarında iştirak edirlər.

Biz İzmirdə olduğumuz müddətdə Cəbrayıl Ələkbərov Antalyada keçirilən, inkişaf etmiş kapitalist ölkələrin travmotoloqlarının iştirak etdiyi konfransa dəvət olunmuşdu. Çox istəmişdilər ki, həmin konfransda Ələkbərov Türkiyəni təmsil etsin. Cəbrayıl həkim isə razı olmamış, Azərbaycan bayrağı ilə iştirak etmişdir.

Cəbrayıl həkim deyirdi ki, Azərbaycanda bir il ərzində 36 cərrahiyyə əməliyyatı etdim. Türkiyədə isə 10 ay ərzində 150-yə qədər cərrahiyyə əməliyyatı etmişəm. Bakıda mənə xasiyyətnamə verəndə yazmışdılar ki, "врач травм.пункта" burda isə bütün Türkiyə travmatoloqlarına İlizarov üsulu ilə müalicəni öyrədirəm.

Əlavə edirdi ki, bütün bunları şikayət kimi etmirəm. Heç kim, Azərbaycanı mənim əlimdən ala bilməz, küsdürə bilməz. Ora yenidən qayıtmaq üçün taleyin hökmü ilə bir müddət Azərbaycandan ayrılmalıyammış.

...Cəbrayıl həkim bir də danışırdı ki, mən uşaq idim atam xəstə idi, xərçəng olmuşdu. Heç kim müalicə edə bilmirdi. Mən istəyirdim ki, həkim olum, atamı mualicə

edim. Gecə-gündüz Allaha yalvarırdım ki, həkim olana kimi atam rəhmətə getməsin.

...Atamı müalicə etmək arzum yerinə yetmədi, atam rəhmətə getdi. Həkim olmaq arzum isə həyata keçdi. İndi həkiməm, çalışıram ki, həmişə xəstələrin yanında qalan narahat ürəklərə şadlıq gətirəm, sevinc bəxş eləyim. Hələ ki, Allah Taalanın köməkliyi ilə, buna az-çox nail oluram. Və bu yolda güc, qüvvət verən inanın ki, həmişə Azərbaycan torpağımızdır. Mən etdiyim hər bir əməliyyatı, hər bir beynəlxalq konfransdakı çıxışlarımı Azərbaycanımıza həsr edirəm.

# AVROPA VƏ AMERİKA HƏQİQƏTLƏRİNƏ DAİR YÜNGÜL GƏZİŞMƏLƏR VƏ YA TƏBİƏT NİYƏ AMERİKAYA QARŞI TERRO AKTI KEÇİRDİ?

*İnsana sevgidən məhrum Avropa*

Avropa çox səliqəlidi. Şəhərin yolları ideal vəziyyətdədir – qıraqlarına plitələr döşənib, plitələrdən sonra çəmənlik başlayır, orada uzanmış otları vaxtında biçir, vaxtında su verirlər. Çəmənliyə zibil-filan atılmır, böyük ağacların dibləri təmizlənir, qazılır. Binaların ətrafı da belə səliqəlidir. Hər şey yerli yerindədir. Mağazalar da ağzınacan dolu. Avropada hər şey var. Məncə çatışmayan bir şey varsa, o da insandır. Avropada insan qıtlığı var. Şəhərlərin, kəndlərin o səliqə-sahmanı nədənsə mənə qəbristanlıqdakı səliqə-sahmanı xatırladırdı.

Məsələn, Almaniyanın Botrof şəhəri saat 18-dən sonra tam qəbristanlığı xatırladır. O səliqəli küçələrdə, o səliqəli şəhər meydanlarında göy çəmənlikdə bir insana rast gəlməzsən. Qəbristanlıqda hərdənbir insanlarla

qarşılaşdığın kimi, orada da hərdən bir insanla qarşılaşa bilərsən. Adam fikirləşir ki, görəsən, bu gözəlliklər, bu səliqə-sahman kimin üçün yaradılıb. Əgər insan üçün yaradılıbsa, bu gözəlliklərdə gəzişən, bu gözəlliklərdən zövq alan insan niyə yoxdur? Oralarda daha çox it, pişik gəzib dolaşır, nəinki insanlar. Hər kəs çəkilib öz daxmasına. İşığı da yandırmırlar ki, pul yazmasın, ya da zəif rejimdə yandırırlar ki, az pul yazsın, küçədən keçəndə onun yanıb-yanmamasını hiss etmirsən. Gedirlər işə, gəlirlər evə. Elə bil evdə oturub nə vaxt öləcəklərini gözləyirlər.

Səmimi ata-bala, ana-bala, nənə-nəvə, baba-nəvə, bacı-qardaş münasibətləri yoxdur. Bütün münasibətləri canlı insan yox, insanların özlərindən çox-çox yuxarıda duran quru yazılar, qanunlar həll edir.

Bu gözəl avropada niyə insanlar çoxalmır? Bu gözəl şəraitdə insanlar da çoxalıb gözəl şəraitdə yaşasınlar, dünyaya nümunə göstərsinlər.

Əgər Avropadakı həyat şəraiti insan qıtlığı yaradırsa, deməli, o həyat düzgün qurulmayıb, inkişaf düzgün getmir. Demək, bu inkişafa başqa keyfiyyətlər əlavə olunmalıdır. Avropalılar, Amerikalılar bunu fikirləşib tapmalıdır. O inkişaf insanın özünü yoxa çıxardırsa, o kimə lazımdır?

Alman qəzetlərinin özləri də yazır ki, artıq Almaniya gənclərinin 30 faizindən yuxarısı türklər və digər millətlərdir. Orta məktəb şagirdləri arasında başqa millətlərdən olanların sayı daha çoxdur. Fransa yığma futbol komandasında fransızlar yoxa çıxmaq üzrədir.

Avropada uşağı o qədər də sevmirlər, ama iti, pişiyi, siçanı, siçovulu daha çox sevirlər. Avropalı uşağı ona görə sevmir ki, ona uşaq kimi, özünün bir parçası kimi baxmır, ona gələcəkdə malına, puluna, mülkünə problem yaradacaq şərik kimi baxırlar. Onun beynində əsas puldur. İt sabah sahibi ilə əmlak davası, pul davası etmir, ona görə çox sevilir, uşaq isə sabah əmlakına, varına-dövlətinə şərik olacaq.

Avropalı kişi arvadına daha çox potensial problemlər yaradacaq şərik kimi baxır. Ona görə də ərlə-arvad bir yerdə yaşasalar da, nikahlarını rəsmiləşdirməyə tələsmirlər.

Ali təhsilli mühəndis olan almanın evində oturub televizora baxırıq. Maykl Ceksonun məhkəməsini canlı göstərirlər. Camaat məhkəmə binasının qabağına yığılıb nəticəni gözləyirlər. Alman məndən soruşdu ki, necə düşünürsən, məhkəmənin nətiçəsi necə olacaq? Mən də cavab verdim ki, əlbəttə Maykl Ceksonu tər-təmiz buraxacaqlar. Alman öz alman soyuqqanlığını itirib hirslənir. Əlini yelləyə-yelləyə deyir ki, sənin

düşüncən Azərbaycan düşüncəsidir. Maykl Ceksona 20 maddə üzrə cinayət işi açıblar, başa düşürsən? Onun heç olmasa 5-6-sı sübut olunacaq. Mən də ona dedim ki, Maykl Cekson bütün dünyaya Amerika həyat tərzini reklam etməklə məşğuldur. Onun vasitəsi ilə nə qədər uşaqlar, gənclər Ceksonsayağı, yəni Amerikansayağı oynayır, Amerika sayağı geyinir, Amerikansayağı yaşamaq istəyir. Amerika belə bir adamı heç vaxt həbsxanaya salmaz. Bu bir şoudur və bu şounun özü də Amerikanı reklam edir, guya Amerikada məhşur adamlar da məhkəmələrə çəkilir, həm də şoudan böyük pullar qazanılır.

Bir azdan sözlərim doğru çıxanda, Maykl Cekson bütün 20 maddə ilə təmizə çıxarılanda alman çox pərt oldu. Açığı, insanın pərtliyi yaxşı şey olmasa da, bu mənə ləzzət elədi. Amma yenə də o, təslim olmaq istəmədi. Dedi ki, o məhkəmə Almaniyada olsaydı, Cekson ən azı 10 maddə ilə iş alardı.

Biz onları başa düşməyə çalışırıq. Onlardan çox şeyləri öyrənmək istəyirik: səliqə-sahmanı, dövlət strukturunun mükəmməl qurulmasını, yüksək səviyyəli avadanlıqların istehsalını iş sistemlərini və s. Onlarsa nədənsə nə bizi başa düşmək, nə də bizdən bir şey öyrənmək istəyirlər.

Almanlar deyir ki, əgər burada yaxşı deyilsə niyə bir belə Azərbaycanlı Almaniyaya gəlir. Deyirəm ki, Avropa, Amerika pepsisini, kolanı, popu, nə bilim daha nələrlə birgə buraların həyat tərzini o qədər reklam edib ki, camaatı çaşdırıb. Gələnlərdə də Avropa haqqında belə təsəvvür formalaşır ki, guya burda ağaclarda avro bitir. Gələnlər aldanırlar. Gəlib buraya düşəndən bir-iki ay sonra peşiman olurlar. Çoxusu da geri qayıda bilmir. Çünki Azərbaycanda evini satıb və s. və i.a.

Bizimlə oturanların hamısı mənim fikrimi təsdiq etdilər ki, biz buraya gələn günün sabahısı peşman olmuşuq.

Almaniya-İsveçrə sərhədi boyunca maşınla 100 km-lə yol getdik. Gözəl təbiət, gözəl dağlar, təpələr, gözəl evlər, amma bütün bu gözəlliklərdə insan gözə dəymir ki, dəymir. Mən bütün bunları görə-görə düşünürdüm ki, Türkiyəni heç vaxt Avropa Birliyinə götürməyəcəklər, götürsələr, bütün Avropa yavaş-yavaş türkləşər. Türklər müharibəsiz, filansız bütün Avropanı tutarlar. Bütün bunları görmək üçün elə də ağıl tələb olunmur.

Avropa, Amerika öz inkişafı adlandırdığı sistemlə dövlətlərini, millətini çox böyük bir uçuruma gətirib çıxarıblar. Bunu dünya qarşısında, öz xalqı qarşısında boynuna almaq çox çətin bir işdir.

Belə bir reallığa baxaq, tutaq ki, ən geridə qalmış Asiya və Afrika ölkələrindən birində bir ailədə 5 uşaq olur. Allah uzaq eləsin, ama bu geridə qalmış ölkədə uşaqlardan ikisi acından ölür. Üçü bir təhər yarı ac, yarı tox böyüyür. Onlardan biri öz ölkəsində qalır, biri Amerikaya gedib çıxır, o biri isə Avropaya. Amerikaya gedən qabyuyan işləyir, evlənir, oğlu Maykl Tayson kimi məhşur boksçu, ya Cordan kimi basketbolçu olur, ya da Karl Lyis kimi uzunluğa tullanır, Barak Obama kimi Amerikanın prezidenti olur. O biri oğlan Fransaya gəlir, oğurluq edir, həbsxanaya düşür, oradan çıxıb evlənir, oğlu olur. Zinəddin Zidan, Anrı və ya başqa bir adla Fransanın yığma komandasında oynayır. Avropalının (amerikalının) isə o geridə qalmış Asiya, Afrika ölkələrindəki ailədən fərqli olaraq heç bir övladı olmur. O, kasıb ailənin 5 uşağından ikisi acından dünyaya gəlib ölmüşdüsə, Avropada uşaqlar dünyaya gəlməmiş və ya anasının bətnində, ya Aygün Kazimovanın reklam etdiyi rezinlərin içində ölür. Milyonlarla uşaq bu qaydada dünyaya gəlməmiş öldürülür.

Avropa və Amerikada kişi və qadının bərabərliyini beyinlərinə o qədər yeridiblər ki, qadınlarla kişilər az qala görünüşcə də eyniləşiblər: kişilər qadınlara oxşayırlar, qadınlar isə kişilərə. Heç kim nəzərə almır ki, bərabər olmayan şeyləri bərabərləşdirmək olmaz. Niyə

qadının qadın, kişinin də kişi haqqı, hüququ olmasın? Yəni qadının haqqı, hüququ kişilərinkindən on dəfə artıq olsun, amma bu məhz qadın haqqı, hüququ olsun. Kişinin haqqı qadının haqqından on dəfə az olsun, amma bu kişi haqqı olsun! Təbiətin yaratdığının əksinə gedilməsin.

Avropa, Amerika yazılmamış qanunları, adət-ənənələri yavaş-yavaş məhv edirlər. Onlarda ancaq yazılmış qanunlar işləyir. Yalnız yazılmış qanunlarla işləyən cəmiyyətin iç üzü isə ekstremal vəziyyətlərdə bütün çılpaqlığı ilə ortaya çıxır. Elə ona görə də Yeni Orlean kimi su altda qalan, dağılan bir şəhərdə polislər iş başında ola bilməyəndə – yazılmış qanunlar işləməyəndə talançılıq başladı, qadınlar zorlandı.

Azərbaycanda isə bir milyon yarım insan yerindən, yurdundan didərgin düşdü, çöllərə, dağlara tökülüşdü, bir dəfə də olsun elə xəbər gəlmədi ki, o çöllərdə, dağlarda kimsə kiməsə başqa gözlə baxıb, kiminsə malını oğurlayıb. Əksinə, insanlar bir-birilərinə kömək etdilər, bir-birilərinə dayaq oldular. Heç tanımadıqları qızlardan, qadınlardan ötrü canlarından keçən kişilərimiz də oldu.

Və sonda... görəsən, təbiət dünyada terrora (axı, bu dünyada terrorlar özü görəsən, nə səbəbdən, haradan

yarandı?) qarşı mübarizə aparan Amerikaya qarşı niyə terror aktı keçirdi?...

Görəsən, Amerikada baş verən "Katrin" qasırğası təsadüfdürmü, ya təbiətin dünyada baş verən qeyri-təbii proseslərə qarşı etirazı idi?

*"Mərkəz" qəzeti,*
*30.09.2005*

## SƏSİN YUVASI

Aşıq Hacı Bayramov Göyçə mahalının Daşkənd kəndində anadan olub. Uşaqlığı otuzuncu illərə düşüb. Üçüncü sinifdə oxuyanda anası rəhmətə gedib və ondan bir neçə ay sonra atası onu daşkəndli Aşıq Abbasəlinin yanına şəyird qoyub.

Aşıq Hacının atası Abbas kişi el arasında Qərib Abbas kimi tanınırdı. Çoxlu nağıllar bilirmiş, elə yerli yataqlı danışırmış ki, elə bil öz gözləri ilə görübmüş.

İndi Aşıq Hacının da danışığı elə şirindi, elə yumorludu, yerli yataqlıdır. Qərib Abbas çox şirin nağıllar danışarmış, avazla oxuyurmuş, amma saz çalmırmış.

Aşıq Hacı sonra Bala Məzrəli Aşıq Hüseynin, daha sonra Aşıq Ələsgərin şəyirdi Aşıq Əsədin yanında şəyirdlik eləyib. Aşıq Hacı deyir ki, zəngulələrimdə hardasa Aşıq Əsədə yaxınlıq var.

Axırıncı ustadı Qanlılı Aşıq Mehdi, məşhur Aşıq Alının şəyirdi Aşıq Qulunun şəyirdi imiş. Aşıq Hacı danışır ki, üç-dörd il Aşıq Mehdinin yanında şəyirdlik etdim. Dastanları danışmaqda rəhmətlikdən çox şey öyrəndim.

Aşıq Hacıyla söhbət edirik.

**– Hacı əmi, sizin oxumağınız ustadlarınızdan hansına oxşayır?**

– Heç hansına. Ustad şəyirdə gərək onun kimi oxumağı yox, özünü, öz səsini, öz danışığını tapmağı öyrətsin. Oxumaq nə deməkdir? (Bir xeylim iç dünyasına çəkiləndən sonra, öz verdiyi suala cavab verir). Hər adamın içində bir göynərti olur, gərək o səsi tapasan ki, o səslə oxuyanda o göynərti canından çıxa. Başqasının səsi ilə oxusan o yanğı çıxmaz, ancaq öz səsin çıxardar o yanğını.

**– Bax, Hacı əmi, məndən aşıq olarmı?**

– Bilmirəm səni sınağa çəkməmişəm. Aşıq olmaq üçün çox keyfiyyətlər lazımdır. Birincisi gərək aşıqlığa həvəs ola. İçində işıq ola. Sonra rəhmətlik qağam deyirdi ki, üç cür səs var. Səs var qarından gəlir, səs var sinədən gəlir, səs var beyindən gəlir. Qarından gələn səs gec-tez batır, sinədən gələn səsdə yanğılıq, həzinlik olur. Ən yaxşısı beyindən gələn səsdir. O səs heç vaxt batmır.

**– Hacı əmi onu necə təyin eləyirsiz?**

– Vallah, nətəri təyin eləməyi sözlə ifadə edə bilmərəm, amma aşıq və ya qeyrisi oxuyanda mənə agah olur.

**– Tanıdığınız aşıqlardan deyin görək, hansının səsi hansı qrupa daxildir?**

– Kiminsə xətrinə dəymək istəmirəm. Amma elə ki, istəyirsən birinin adını çəkim. Məsələn, Aşıq Ədalətin səsi sinədən gəlir. Aşıq Müseyib “Qaragöz” oxuyub, bax o səs beyindən gəlir. Rəşidin səsi beyin səsidi.

**– Hacı əmi bəs sizin səsiniz hansındandır?**

– Mənim də səsim deyəsən beyindən gəlir. Özüdə vallah mən bunu özümü tərifləmək uçun demirəm. Çox vaxt sən oxuyursan, oxuduqlarını dərk eləmirsən, üstündən neçə illər keçəndən sonra, oxuduğunu yavaş-yavaş sənə agah olur.

*Aşıq Hacının 80-ci illərdə birinci dəfə flarmoniyada, Respublika sarayında çıxışları oldu. Radioya, televiziyaya, xarici dövlətlərə dəvət olundu. Televiziyada "Aşıq Alı" dastanını söylədi. "Aşıq Alı" dastanı televiziyanın qızıl fonduna düşdü.*

*Aşıq Hacı bu yaxınlarda – 1992-ci ilin noyabrında Türkiyədə keçirilən Konya aşıqlar bayramına dəvət olunmuşdu. Aşıq Hacı Süleyman Dəmirəlin imzası ilə Atatürk adına qızıl medala layiq görüldü. 1991-ci ilin may-iyun aylarında Almaniya-Azərbaycan cəmiyyətlərinin dəvəti ilə gedib Berlin, Frankfurt-Mayn, Köln, Düsseldorf şəhərlərində konsert verdi. Vaxtını uzadıb 10 gün də saxlayıblar Almaniyada.*

Söhbəti davam etdiririk.

**– Hacı əmi valınız varmı?**

– Elə bayaq onu demək istəyirdim, Almaniyada, Türkiyədə tez-tez mənə yaxınlaşırdılar ki, çox rica edirik, mümkunsə, valınızdan, kasetinizdən birini bizə bağışlayasınız. Deyirdim ki, valım, kasetim yoxdur. İnciyirdilər, başa düşə bilmirdilər ki, bu vaxta kimi mənim valım, kasetim buraxılmayıb.

**– Hacı əmi, Sizin "Gilənar", "Ağır Şərili" havalarınız daha məşhurdu.**

– Yəqin mənim içimdəki yanğılar dərdlər daha çox o havalar üstündə köklənib.

**– Xoşlamadığınız, oxumaq istəmədiyinz havalar varmı?**

– Bəlkədə var, amma incimə deməyəcəm.

**– Qaçaqaçdan sonra, niyə Çardaxlını seçdiniz, Bakı daha yaxşı deyildimi?**

– Bakıda mən nə evi özümünkü kimi hiss eliyə bilirəm, nə ayağımın altındakı asfaltdan torpağı hiss eliyə bilirəm, nə də özüm özümü. Nə bilim bəlkə başqa səbəblər də var...

**– Neçə şəyirdinz olub?**

– Şəyirdilərim çox olub, amma, olardan Aşıq İslam və Aşıq Nuridindən daha razı qalmışam.

**– Hacı əmi bax televiziyada, ya kasetdə öz oxumağınıza qulaq asanda özünüzdən xoşunuz gəlirmi?**

– Yaman yerdə yaxaladın məni. Hələ heç kəsə deməmişəm, deyəsən sənə bir sirrimi açacam... Bilirsən, ən çox ürəyimcə oxuduğum nə vaxt olur? Yuxuda. Tez-tez yuxuda oxuyuram, bəzən elə olur ki, ağlaya-ağlaya oxuyuram, sabahısı günü ayılıb yuxuda oxuduğum havanı başlayıram oxumağa. Oxuyuram... oxuyuram, amma görürəm ki, yox, yuxudakı kimi alınmır ki, alınmır... Yəqin yuxudakı kimi oxusam, bir də yuxuda oxumaram... Heyif ki, yuxuda oxuduqlarımı özümdən başqa heç kim eşitmir.

Aşıq Hacı bunu deyib çəkilir öz iç dünyasına və mən onu öz dünyasından bir daha ayırmaq istəmirəm.

## GÜNORTAYADƏK...
## ÜÇ SAAT MANAF SÜLEYMANOVLA[1]
## I hissə

*Ulu tanrı vergisi verilib Manaf Süleymanova. Maraqlı adamdır, həmsöhbət kimi.*

*Az-çox rast gəldiyimiz müdriklərdəndir.*

*Həlimliyi var, işıqlı siması var, ağayana hərəkətləri var...*

*Konkretliyi var, dəqiqliyi var. Sözlərində çəki, kəlmələrində dolğunluq var. Ən vacib, insani keyfiyyətlərə malikdir bu dünya görmüş kişi.*

*Duzlu-məzəli zarafatlarından qalan deyil. Düz söz deməkdən çəkinən deyil. Elə buna görə də daxili ciddiliyi, mənəvi-ruhi intizami heç vaxt pozulan deyil.*

*Manaf Süleymanovu kitablarda bizə belə tanıdıblar.*

*Real həyatda da beləcə gördük, beləcə tanıdıq Manaf Süleymanovu.*

Qapının cəftəsini özü qaldırdı. İlk qapı zəngindən dərhal sonra. Yaşına uyğun titrək barmaqları ilə barmaqlarımı sıxdı. Çoxdanın tanışları kimi hal-əhval tutdu. Xoş gəldin dedi bizə. Evinin yuxarı başında yerimiz hazır idi. Lakin soyuqdan əsim-əsim əsirdik. Şirin xatirəli, ciddi, məntiqi sonluqlu söhbətlər də elə burda başlandı.

[1] Rüstəm Dastanoğlu və Hüseyin Əzizoğlu

Yəni Manaf Süleymanov da belə mənzildə yaşayarmış?

Yəni Manaf Süleymanovun da evində qışın sərtliyi bayırdakı kimi hiss olunarmiş?

Yəni...

Yəni Manaf Süleymanov da sağlığında unudularmış?

Ürəyimizi oxuyurmuş kimi:

Çoxları kimi siz də elə bilirdiniz ki, mən milyonerəm, – dedi Manaf müəllim və sözlərinə əlavə etdi: – Çoxu mənə deyir ki, ay Manaf müəllim, pul səndə, çıxart xərclə! Gündə o televizorda ki, sən çıxış edirsən, Bakı haqqında, yəqin hər çıxışında əlli min verirlər. Deyirəm, adə, əlli min nədir, on yumurtanın pulunu da vermirlər. Mən çoxu ondan ötrü gedirəm ki, bəlkə bu camaatı başa sala bilim ki, zəngin tariximiz olub. Bəlkə bunun gələcəkdə nəsə xeyri dəysin camaata.

Bax, budur mənim vəziyyətim. Buna da çox şükür ki, şalvarımın dizləri tam sürtülməyib...

Manaf müəllim zarafatınnan qalan deyildi. Elə bu zarafat üstündə də bizə Hafiz Şirazi ilə bağlı bir hadisəni nəql etdi:

Teymurləng gəlib Şirazın ətrafında dayanır ki, şəhəri viran qoyacam. Qoşunun qarşısını almaq üçün heç bir tədbir mümkün deyilmiş. Hafiz Şirazi onda məhşur imiş. Deyir ki, mən gedirəm Xaqanın yanına, ondan

iltimas eliyərəm ki, bizim Şirazı dağıtmasın. O, çılpaq səhranın içində bir gül dəstəsidir, bu bir şəhərdir ki, bərabəri bütün dünyada yoxdur. Camaatın inamı yoxmuş: – Hafizə, yəqin ki, qulaq asmaz. Gedir. Xaqan onu qəbul eləyir, sözlərinə qulaq asır fikrindən vaz keçir.

Bir bax gör ki, Teymur kimi əzazil, qaniçən bir xaqan yaradıcının şərəfinə fikrindən daşınıb. Bir də şairin sözünün şərəfinə bax ki, xalqa necə xidmət eləyib.

Hafizin bir şeiri var. Türk gözəlinə aşiq olduğundan yazır. Yazır ki, bu türk gözəli mənim ürəyimi alsa, mənə ram olsa, onun o qara hindu xalına Səmərqəndi, Buxaranı bəxşiş eliyərəm.

Hafizin düşmənləri bu şeiri eşidir, Teymuru qızışdırmaq istəyirlər. Deyirlər: Xaqan, sən onun xatirinə Şirazı dağıtmadın, o sənin şəhərlərini bir türk qızının xalına qurban eləyir. Özü də türklərlə arası olmur Teymurun. Çağırtdırır hüzuruna, soruşur ki, bu nədir, mənim paytaxtımı bir türk qızının xalına qurban verirsən? Hafiz də ləbbadəsini açır, paltarlarını göstərir. Teymur görür ki, cır-cındır içindədir.

Hafiz deyir:

Qibleyi-aləm sağ olsun! Xaqan, elə ona görə bu cır-cındır içində qalmışam ki, var-yoxumu gözəllərə vermişəm, gözəllərin qara xalına bağışlamışam.

Teymur kimi daş qəlbli insan başlayır gülməyə. Əfv edir.

Bütün bunları nəyin üstündə deyirəm. Ona görə deyirəm ki...

...Sən də elə bilirsən ki, mən milyonerəm. Görürsən ki, Hafiz kimi, mənim də var-dövlətim cır-cındırımdı.

Buyur xaqan, buyur bax!

Böyük xaqanlar da, qan içən həmkarlar da həmişə şairə yazıçıya, onların sözünə böyük hörmətlə yanaşıblar. Onların şərəfinə nə desən ediblər. Bizdəsə şairə də, yazıçıya da hörmət-izzət çoxdan yoxa çıxıb və Manaf Süleymanova da göstərilən qayğı, bax budur.

Otaqları gəzirik. Çoxlarımızın evi kimi bum-buz, bəzəksiz, düzəksiz. Bu evə zinət, bəzək-düzək verən, zənginlik gətirən yalnız bircə şey var. Divar boyu sıralanmış, rəflərə düzülmüş və künc-bucağa qalaqlanmış kitab-dəftərlər və bir də Manaf müəllimin özüdür.

Manaf müəllimin mənzili əsl şəkil qalereyasıdır.

Dünyanın çox ölkəsindən gətirilmiş tablolar divar boyu düzülüb, yan-yana qalaqlanıb. Burada, hətta mərhum Səttar Bəhlulzadənin bizə tanış olmayan bir neçə qiymətli əsəri də var. Təəssüf ki, bu kiçik, dar mənzildə bu tabloları yan-yana düzməyə imkan yoxdur.

Neçə dəfə demişəm, bir yer versinlər. Sərgi düzəldim bu əsərlərdən. Hərə öz kefindədir. Sənətə qiymət verən kimdir? Sənət puç olub gedir, sənətkarlar sənətkar olduqları üçün heyfislənir, sənət əsərləri künc-bucaqda çürüyür baxımsızlıq üzündən.

Yaşı 80-i ötmüş müdrik yazıçı ilə həmsöhbət olmağın nə şirin anları olarmış? Manaf müəllimin söhbətindən doymaq olmur. Dinləmək. Dinləmək istəyirsən saatlarla.

Manaf müəllimlə söhbət edərkən sual verməyə o qədər də ehtiyac olmur. Qabaqcadan hazırlanmış sualları, qabaqcadan duyur. Onun danışığında suallarımıza dolğun cavablar vardı. Manaf müəllim, nədən və necə danışmağı da qabaqcadan bilirmiş.

**– Zəngin həyatınızda peşmançılığını çəkdiyiniz bir şey olubmu? Ümumiyyətlə razısınızmı həyatınızdan?**

– Bir şeir var. Həmin şeirlə sualınıza cavab vermək istərdim.

*Xatirindən çıxmasın, dünyaya üryan gəldiyin!*
*Xəlqi xəndan eyləyib, kiryani halən gəldiyin!*
*Xəlqi kiryan eyləyib, şadani-xəndan getdiyin.*

Şeirin məzmunu belədir ki, adamın özü dünyaya ağlaya-ağlaya lüt-üryan gəlir. Ətrafındakıları sevindirir, güldürür bu gəlişiylə. Sonra şeirdə deyilir ki, çalış, fəzilət qazan, elə ad çıxar ki, sən gedəndə xalq ağlasın, sən gülə-gülə gedəsən.

Əşi, mən dünyaya gələndə lüt olmuşam. İndi Allah gətirib məni bu yerə çıxardıb. Şükür, min şükür kəramətinə. Niyə dünyadan peşman getməliyəm ki?!

**– Manaf müəllim, deyirlər ki, həyatınız həmişə qeylü-qalda keçib...**

– İlk əvvəl ona görə ki, həyat tarixçəm xalqımızın tarixinin olduqca mürəkkəb bir dövrünün tərkib hissəsi-

dir, onu təsdiq edir və onda təsdiq olunur. İkincisi, ona görə ki, zəif uşaqlığım var idi. Xüsusi qayğıya möhtac idim. Hətta, körpə vaxtı necə olursa boğazımdan yara çıxır və əmim Məşədi Əsədulla Quranı götürüb deyir ki, ay Allah bu uşağa kömək elə sağalsın, onu Xorasana ziyarətə aparacağam.

...Və həyatım nə qədər qeylü-qalda olsa da bir lahıçlı kimi qalmışam; Lahıç kimi təmiz, Lahıç kimi saf, Lahıç kimi...

**– Sizin xronoloji hafizə qabiliyyətiniz barədə də çox yazılıb. Həyatınız boyu cəmiyyətdə baş verən hadisələri bütün təsfilatı ilə danışmaq bacarığınız barədə də danışırlar. Ümumiyyətlə, ədəbiyyata gəlişiniz bütün bunlarla bağlı deyil ki?**

– Nəzərimdən heçnə qaça bilməz. Uşaqlığımdan tutmuş bu günə qədər nə baş veribsə, təfsilatı ilə yadımda, gözlərimin önündədir. Ədəbiyyata gəlişimə də səbəb elə bu olub bəlkə.

Daha doğrusu Mehdi Hüseyn gətirdi məni ədəbiyyata.

İnstitutda işləyirdim. Dosent idim. Professorlar otağında idik. Birdən Nadir şahdan söhbət düşdü. Mən Nadir şahın adı ilə bağlı “şah almazı” əhvalatını danışdım. Almazın üstündə yazı yazmaq mümkün olmasa da, (çünki o sərt mineraldır) Hindistanda (Manaf müəllim yazmağımızı xahiş edir) belə bir almaz olub. Üstündə də “şah almazı” yazısı varmış. Nadir şahın hansı

çətin əzablı yollarla Hindistandan o almazı gətirməsi əhvalatını söylədim. Bu böyük marağa səbəb oldu.

Məhşur kimyagər, professor Şahtaxtinski hamının əvəzindən dilləndi: Elə söyləyirsən ki, elə bil 300 il əvvəl Nadir şahın yanında olmusan. Hamı mat-məəttəl qalmışdı ki, bu cavan uşaq, bu şeirləri hardan bilir.

Dedilər ki, danışdıqlarını niyə yazmırsan? Elə bil yazmaq üçün ilham verdilər mənə. Bir dəfə də dedilər ki, Sabit Rəhman neft haqqında kino çəkir. Get kömək elə, məsləhətçi ol. Uzun tərəddüddən sonra razılıq verdim. Getdim sədrliyə, çox centilmen, çox nəcib, çox gözəl adam idi. Götürdu telefonun dəstəyini və Mehdi Hüseynə zəng elədi ki, sənə köməkçi tapmışam, yanına yolladı. Tanış olduq. Sual-cavab... Xoşuna gəldi danışdıqlarım, məsləhətçi oldum. "Qızıl çeşmə" filminin ssenarisini yazırdı. "Abşeron"u da onun əsasında yazdı. Öz aramızdı, "Abşeron"un da yazılmasında Mehdiyə çox köməkliyim dəydi. Hətta özü mənə deyirdi ki, niyə yazmıram.

Bir hekayə yazmağı tapşırdı.

– Yaşım 30-u keçmişdi o hekayəni yazanda. Mövzusunu da ordan götürmüşdüm ki, tələbə olanda Lökbatanda bir quyu fontan vurmuşdu. Sutka ərzində 20 min ton neft verirdi. Hər tərəf neft dənizi olmuşdu. Bizi də aparmışdılar ora işləməyə. Rəhmətlik Mircəfər Bağırov da oraya gəlmişdi. Və ilk hekayə də Lökbatandakı o "məhşur fontan"ın şərəfinə yazıldı.

Hekayəni qoltuğuma vurub yollandım redaksiyaya. Əhməd Cəmil rəhmətlik məni İlyas Əfəndiyevin yanına yolladı. Tapşırdı ki, oxusun, gözəl yazılıb. İlyas da oxuyub bəyəndi, mənə hətta gözəl məsləhətlər də verdi.

Mehdi Hüseyn jurnal redaktoru idi. O da hekayəyə baxdı, dedi ki, mən çap edəcəm. Amma azdı. Sənsə çox bilirsən, get genişləndir.

Həmin hekayə əsasında "Yerin sirri" povestim beləcə yarandı. Həmin povest əsasında "Dalğalar qoynunda" "Fırtına" romanları yarandı. Bu 3 əsər neft haqqında trilogiya idi.

Onda Fadeyev Bakıya gəlmişdi. Ona ilk kitabım barədə məlumat verdilər. Onda Fadeyev "Abşeron"u Stalin mükafatına təqdim etmişdi. Demişdi ki, "Yerin sirri" tez yazılsaydı, mükafat ona çatmalı idi.

**– Manaf Süleymanov yaradıcılığını məhsuldar hesab edirmi? Ən çox sevdiyiniz, sizə daha yaxın, daha əziz əsəriniz?**

– Cəfər Cabbarlının neçə piyesi var idi? "Dönüş" onların ən zəifi idi, elə deyilmi? Bir gün ondan soruşurlar ki, ən çox sevdiyin hansı əsərindir? Düşünüb-daşınmadan deyir: "Dönüş". Deyirlər a kişi nə danışırsan? "Oqtay Eloğlu", "Od gəlini", "Aydın" hara, "Dönüş" hara? Cəfər gülümsüyüb cavab verir ki, ata-ana xəstə uşağı hamıdan çox istəyir. "Dönüş"də mənim xəstə övladımdı. Siz də yazın ki, Manaf Süleymanova bütün əsərləri həm yaxın, həm doğma, həm də əzizdir.

O ki qaldı məhsuldarlığa, əgər Manaf Süleymanova bütün əsərləri doğmadırsa, deməli o məhsuldar işləyib. Yaradıcılıqda say vacib şərt olmamalıdır. Keyfiyyətlilik, oxunaqlılıq üstünlük təşkil etməlidir. Bax, məhsuldarlıq buna deyirlər. Adını çəkdiyim trilogiyadan başqa mənim "Zirvələrdə" "Eşitdiklərim, Oxuduqlarım, Gördüklərim" kimi əsərlərim var. Povestlər, hekayələr də çox yazmışam. Həm də neçə-neçə xarici ölkə yazıçısının əsərini dilimizə çevirmişəm. Mənim əsərlərim dəfələrlə xarici ölkələrdə çap olunub.

**– Amma oxucularımız çox təəssüflənirlər ki, yüksək adlar arasında sizin adınız həmişə çox az çəkilib.**

– Mənim əsərlərim yalmanmağı, yaltaqlanmağı bacaran hər bir kimdə olsaydı, 3-4 dəfə laureat, xalq yazıçısı olardı. Yenə də sağ olsunlar. Hərdən yad edib nəsə verirlər. Adı almaq da çox işləyən yazıçı üçün bir təsəllidir. Təki sağlıq olsun, qalan şey sonradan düzələndir.

Bircə o vaxt sevindim ki, "Hacı Zeynalabdin Tağıyev" adına xatirə medalı yazıçılardan birinci mənə, şairlərdən ilk dəfə Məmməd Araza nəsib oldu. Həm də "Əməkdar mədəniyyət işçisi", "Əməkdar incəsənət xadimi"yəm.

Əsl sənət üçün belə şeylərin dəxli yoxdur. Sənətkar ad, fəxri mükafat xətrinə yazmamalıdır. Sənətkar sənəti sənət etmək, sənəti sevdirmək, sənəti yaşatmaq üçün yaratmalıdır.

*"Millət" qəzeti,*
*05.12.1993*

# GÜNORTAYADƏK... ÜÇ SAAT MANAF SÜLEYMANOVLA
## II hissə

"Məndən olsa, çörəyi çörəkçiyə verərdim, birini də üstəlik".

Elə sənətkarlar var ki, zamanın, dövrün tələbləri onu öz qəlibinə salır, yaradıcılığını cılızlaşdırır, dünyagörüşünü məhdudlaşdırır. Manaf Süleymanov üçünsə dövr, zaman məfhumu olmayıb. Onun yaradıcılığı bu qəlibi parçalayıb. Manaf Süleymanov istədiyi anda istədiyini deyə bilib. Çünki kiminsə qəlbini oxşamaq, kiminsə xoşuna gəlmək üçün yazmayıb Manaf Süleymanov.

...Söhbətimiz yenə də uzanır.

Onun dediklərində hər şey var: sənət yanğısı da, Vətən təəssübü də, həyat reallıqları da...

Və bir də siyasət...

**– Manaf Süleymanovun siyasi həyatda aktiv olmaması çoxlarına parodoksal təsir bağışlayır. Ölkənin siyasi həyatı ilə bağlı problemlər sizi də düşündürmürmü?**

– Bizdə siyasət anlayışını bir az düzgün başa düşmürlər. Çoxları elə bilir ki, siyasət yalnız səs-küy salmaqdan ibarətdir. Əslində isə, siyasətin mənası başqa yöndə izah edilməlidir. Yerindən duran siyasətdən danışdısa, vay belə siyasətin halına. Çirkin, tör-töküntülü bir aləmə bənzər bu siyasət. Siyasətdə hər kəs

öz çəkisinə uyğun yükün altına girməlidir ki, sonra camaat arasında xar olmasın.

Yazıçı hər şeyi – dövrün, zamanın hadisələrini, öz yaradıcılığında düzgün əks elətdirirsə, elə bunun özü siyasətdir. Yazıçı siyasətçi olmaq, kiməsə yalmanıb-yaltaqlanmaq xatirinə əsərinə lazımsız yamaqlar vurursa, vay onun halına. Tarixin fırçası onu rəngləyib aradan elə siləcək ki...

Zaman hər şeyi üzə çıxaracaq, ələkdən keçirəcək.

*Çalxalandıqca, bulandıqca zaman nehrə kimi,*
*Yağı yağ üstə gedir, ayranı-ayranlıq olur,*
*Un təmənnası ilə buğda dəyirmanlıq olur.*

Ələyir, e, hər şeyi zaman özü ələyib üzə çıxardır. Kimin kim, nəyin nə olduğu üzə çıxır.

Tarix həqiqəti sevəndir. Yazıçı həqiqəti sevən tarixdən qorxmalıdır. Qorxmalıdır ki, adının üstündən qara xətlər çəkməsin. İstərdinmi, Manaf Süleymanov da siyasət fəalı olmaq üçün dəridən-qabıqdan çıxıb adının üstündən eninə-uzununa qara xətlər çəkdirəydi?! (Gülür).

Məncə, Manaf Süleymanov bu gün ən peşəkar siyasətçidir. Demək istədikllərini qələmi yazıb, tarixə salıb. Qoy, məni qınasınlar, çox qınasınlar! Sonradan pis adam olmaqdan yaman qorxuram.

**– Bə, əqidə, məslək anlayışı? Onu Manaf Süleymanov necə başa düşür?**

– Manaf Süleymanov onu yaxşı başa düşür ki, insan bir dəfə doğulursa, deməli onun bir əqidəsi olmalıdır. Eləsi var, deyir ki, mən altı çağırış Ali Sovetə deputat seçilmişəm. Vay, sənin! Ədə, bu nə deməkdir, axı, sən neyləmisən, xalqa nə xeyir vermisən? İyirmi, otuz il komsomol, kommunist əqidəsinə səcdə eləmisən, axı. Sonra sosdem olmusan, daha sonra şadepeçi, daha sonra nə bilim, nə, nə, nə... Əşşi, əqidəni də dəyişmək olar? Axı, sən bunun səfasının görmüsən, cəfasını da qəbul eləməlisən. Mən qəlbən öz əqidəmə inanmışam və bundan dönən də deyiləm. Sevinirəm ki, bu günədək bir əqidəm olub, o da daxilimdə cücərərək boy atıb. Mən yazıçıyamsa, mənim sənət ehtiraslı əqidəm olmalıdır. Nəyimə lazımdır mənim kommunist əqidəsi və yaxud vəzifə məsləki.

**– Yəni, siz indiyədək heç bir partiyanın üzvü olmamısınız? Hətta, kommunist partiyasının da?!**

– Mən bir adam tanıyıram. Partiyaya keçmək üçün 3 dəfə arvadını zəmanət almaq üçün bir ortabab adamın evinə göndərmişdi. Bu yazını oxusa, indi bağışlanmaz səhvini başa düşər. Deyirdim, ədə, sənin nəyinə lazımdı bu partiya. Get işində, gücündə ol! Ayıbdır axı! Fikir vermədi. Dəridən-qabıqdan çıxdı. İstədiyinə nail oldu. Nə olsun?

Bunu mən pis mənada yozmaq üçün demirəm. Ümumiyyətlə, onu demək istəyirəm ki, elə şeydən ötrü bu cür alçaqlığa getmək olmaz.

**– İndi bizdə əsl dil və ədəbiyyat münaqişəsi gedir. Türk dili ifadəsini Manaf Süleymanov necə qəbul edir?**

– Tarixi keçmişə qayıdışı Manaf Süleymanov necə qəbul etməlidir ki, mənim əsərlərim keşməkeşli tariximizdən qidalanmayıbmı? Tarixin keşməkeşlərində biz dilimizin əsl adını da unutmadıqmı? Qoy olsun, Türk dili, qoy olsun latın əlifbası! Amma, çalışmaq lazımdır ki, ədəbiyyatımızı, tariximizi yaşada bilək. Hər şeyi ölçüb-biçəndən sonra qərar qəbul etmək lazımdır ki, çətinliyə düşməyəsən. Onda belə mənasız mübahisələr də olmazdı. Məncə, dilimizin öz adını qoymaq üçün **Azərbaycan Türkçəsi** sözü daha yatımlı olardı.

**– Konkret olaraq, deyə bilərsinizmi, yaradıcılığınızda problemlər dövrünün yeri olacaqmı?**

– Ömür vəfa eləsə, imkan, şərait olsa, sözsüz ki... Bu da konkret cavab.

Mən indi gördüklərimi, eşitdiklərimi, oxuduqlarımı qələmimlə əbədiləşdirməyə çalışıram. Bəlkə bunun sonradan xalqa nəsə bir xeyri dəydi. Yoxsa, bu gedişlə hər şey unudulacaq. Hər bir şey deyəndə tarix də unudulur.

**– Respublikada qarşı duran tərəflərə ağsaqqal sözünüz? Çox şeydə milləti qınayanlara, millətimizi millət kimi qəbul etməyənlərə nə deyərdiniz?**

– Məncə, bu qarşıdurma sözü bir az düzgün çıxmır. Normal cəmiyyətdə hər şey olmalıdır. Ədalət uğrunda

mübarizə də, çoxpartiyalılıq da, müxalifət də... Bunu nəyi qarşıdurma oldu? Ümummilli mənafe naminə son məqamda məslək və əqidəsindən asılı olmayaraq adını azərbaycanlı qoymuş hər kəs bir amal uğrunda birləşə bilir. Meydan hadisələri yadınızdadırmı? Millətin ki, bütün zümrələrindən olan nümayəndələri belə sıx birləşə bilirsə, bu o millətin böyüklüyüdür. Millətə "bədbəxt" yamağı vuranların ağzından vurmaq lazımdır.

Bədbəxt o millətdir ki, tikmədiyini geyir, əkmədiyi taxılın çörəyini yeyir. Nə olub, mənim millətimə? Geyməyə paltarı da, yeməyə çörəyi də boldur. O ki, qaldı bu günkü pərakəndəliyə, o ötəridir, gəlib-keçəndir. Görərsən, bu millət axırda necə birləşəcək, onun çörəyini yeyib, üzünə ağ olanların payını necə verəcək? Görərsən, birləşib axırda qatı düşmənləri nə günlərə salacağıq.

**– Siz də beləmi başa düşürsünüz ki, birləşmədən düşmən üzərində qələbə çalmaq mümkün deyil? Axı bu gedişlə yolumuz hayana ola bilər?**

– Səhv edirsiniz, yenə də. Bəyəm, indiyə qədər birləşməmişdik? Bu cür gurultulu sözlərdən qaçın. O boş sözdür. Bu millət həmişə bir yerdə olmağı bacarıb. Müharibədə müvəqqəti məğlubiyyətimizin başqa səbəbləri var. Dövlət varsa onun nizami ordusu olmalıdır, ordu varsa onun intizamı, bacarıqlı hərbçi mütəxəssisləri olmalıdır. Bunsuz müasir müharibədə qələbə mümkün olan iş deyil. Babəkliyimizi, xətailiyimizi, cavanşirliyimizi sübut etmək üçün tankın qabağına xən-

cərlə çıxmamalıyıq ki?! Orduya müasir hərb sənətini bilən bacarıqlı komandirlər lazımdır. Güclü ordusuz müharibədə dönüş yaratmaq olmaz. Əsl hərbçilərin köməyi ilə ADR dövründə 1 ildə 35 minlik ordu yaradıldı. Mehmandarov, Şıxlinski, Səlimov kimi generallar olmasaydı Zəngəzuru onda təkrar Azərbaycana qaytarmaqmı mümkün olardı?! Bu böyük şəxsiyyətlər hərbi bilikərinə arxalanıb bu ağır yükün altına girmişdilər.

Hərbi nazir vəzifəsi kompitent adama tapşırılmalıdır.

Hərbi nazir qorxmaz, prinsipal, sözündən dönən olmamalıdır. İmkan verməməlidir ki, ordudan hərə istədiyi kimi istifadə etsin. Səməd bəy Mehmandarovun parlamanda çıxışlarını oxumamısınızmı? Dəfələrlə deyib: "Mən imakan verərəm ki, ordunu sağmal inəyə döndərib, istədikləri kimi istifadə etsinlər".

Hərbi nazir belə qətiyyətli olar. İmkan verməz ki, ordu siyasi işlərə qarışa. Ordu siyasətə qarışdımı, sıralarında pərakəndəlik yaranar. Hərə istədiyi səmtə çəkər.

Bir də komandirin yerişi də, duruşu da hərb qanunlarına uyğun olmalıdır. Əliağa Şıxlinski cəbhədə döyüş xəttində olur. Yaponların top mərmisi iki addımlığında partlayır. Diksinmir də! Sadəcə dəsmalını çıxarıb üz-gözünü silir. Generalda ürəyə bax! Bax, hərbçi bu cür qorxmaz olar.

Yerindən duran komandir olmaz ki?!

Komandir də döyüş meydanından qaçar?! Onda yazıq sıravi neyləməlidir?

Müvəqqəti məğlubiyyətə görə ruhdan düşmək olmaz. Yolumuz qələbəyədir. Deyəsən, artıq özümüzə gələ bilmişik.

**– Müstəqil Azərbaycan və onun prezidentləri. Bu günkü gerçəkliklər sübut edir ki, prezident və onu dərk etməkdən uzaq olan xalq arasında uçurum problemi mövcuddur. Bunu "anlamaq dərdi" kimi başa düşmək olarmı?! Azərbaycan Respublikasının prezidentini necə görmək istərdiniz?**

– Bu xalq hər şeyi anlayır. Onun "anlamaq" adlı dərdi yoxdur. Prezident gərək ağıllı, humanist ola ki, xalq onu başa düşə.

Respublikaya xarici qonaqlar gələndə onları müşaiyət etmək üçün həmişə məni çağırardılar. Çox dil bildiyimə görə. Bir də ona görə ki, mən şəhəri yaxşı tanıyıram. Binaların tarixinə bələdəm. Bilirəm ki, hansını hansı milyonçu tikdirib. Bilirəm ki, hansı binanın təmtərağına görə neçə belə adamlar öldürülüb, sürgün edilib.

Bir dəfə Fransadan qonaqlar gəlmişdi. Mən onlara bir sual verdim. Sizdə Deqol nə qədər məşhurdur? Elə danışırsınız ki, guya bu saat Avropada ondan məşhur adam yoxdur. Dedilər ki, Deqol Fransanın prezidentidir. Fransız xalqının əxlaqı, şərəfi, namusu, vicdanı və

fəxridir. Bax, mən xalqımıza kiçikdən-böyüyə hamımızın sevə biləcəyimiz belə prezident arzulayıram. Prezident əslində belə olmalı, bütün millət hörmət etməlidir.

Birdə ki, prezident ağıllı və humanist olmalıdır. Maliyyədən, iqtisadiyyatdan, qanunçuluqdan... başı çıxmalıdır. Hamıya eyni gözlə baxmağı bacarmalıdır.

Ağıllı prezident imkan verməməlidir ki, onu tərifləsinlər. Mircəfər Bağırovu kimin hünəri vardı tərifləsin. O saat həmin adamın abrını ətəyinə bükərdi. Bilirdi ki, bu yaltaqlıqdır. Hətta, ürəkdən tərifləyənə də imkan verməzdi. Yaxşı yadımdadır, Qələbə münasibətilə banket idi. Orda da heç kim cürət edib Mircəfərin sağlığına badə qaldırmadı. Axırda yalnız Səməd (S.Vurğun nəzərdə tutulur – red.) özündə cəsarət tapdı. Ayağa qalxıb ürəkdən dedi ki, içək bu badəni Azərbaycanımızın Koroğlusu Mircəfər Abbas oğlunun sağlığına. Mircəfər ona elə tərs-tərs baxdı ki...

Daha demədi ki, xilaskarımız, peyğəmbərimiz, Allahımız Mircəfərin sağlığına. Prezident Alllah ola bilməz. Prezidentin şərəfinə bu günkü deyimlər, tariflər lap ağ olur.

**– Azərbaycan adlı bir məmləkətin tarixində tanınmış dövlət xadimi kimləri hesab edərdiniz?**

– Biz hərənin dalınca bir daş atmışıq. Bəyəm, bizim "Müsavat"ın dövründə pismi dövlət xadimlərimiz vardı? Fətəli xan Xoyski, Nəsib bəy Yusifbəyli, Məmmədə-

min Rəsulzadə rus imperializm məngənəsində bərkimiş, tanınmış dövlət adamları idi.

Nəriman Azərbaycan üçün azmı iş görüb? Onun böyüklüyü ondaydı ki, respublikanı parçalamağa qoymurdu. Azərbaycan torpaqlarını Gürcüstan, Ermənistan, Rusiya arasında parçalamaq istəyirdilər. Hətta söhbət vardı ki, Abşeron yarımadası, Bakı da daxil olmaqla, xüsusi statusla Moskvaya tabe olsun. Nəriman buna imkan vermədi...

Mircəfər bizi iki dəfə sürgündən xilas etdi.

İndiki prezidentimizin də xalq qarşısında xidmətləri böyük olub. Amma nöqsanları da az deyil. Bu səhvlər özünü ətraf seçməkdə daha qabarıq göstərir.

Mircəfərin vaxtında onun bircə qohumu da qoxusundan hakimiyyətə yaxın düşə bilməzdi.

Yəqin Lidiya Rəsulovanı yaxşı tanıyırsınız? Görəsən, o, heç olmasa öz dilini yaxşı bilirmi? Yadımdadır, metronun 28 May stansiyasının yanında C.Cabbarlının heykəlini qoyurdular. Biri dedi: heykəl çox böyükdür. Ortadan kəsilməlidir. Lidiya da haray-həşir qopardı ki, bura Şaumyanın heykəli yaraşır. Bu zonada ermənilər sayca üstünlük təşkil edir.

Baxın da!

Bir sözlə, dövlət xadimləri – Rza şah səpgili adamlar olmalıdır. Dağılmış İranı böyük dövlət eləyə bildi. Məndən olsa, çörəyi çörəkçiyə verərdim, birini də üstəlik.

**– Cavan siyasi liderlərimizdən kimləri gələcəyin dövlət xadimi kimi görürsünüz?**

– İsa Qəmbərdən, Etibar Məmmədovdan çox şey gözləmək olar. Prinsipialdırlar, mübarizdirlər, qətiyyətlidirlər. Beyinləri təmizdir, düşüncə tərzləri yenidir. Bir-balaca leksikonlarını zənginləşdirməyə çalışmalıdırlar. Dövlət xadimi danışanda millət ayağa qalxmalıdır. Bunu bacarmaq lazımdır.

**– Millət vəkili seşilsəydiniz, Milli Məclisdə daha çox hansı məqsəd uğrunda mübarizə aparardınız? Ümumiyyətlə, iclasların gedişindən, deputatların çıxışlarından xoşunuz gəlirmi? Ürəyinizdən məclisin üzvü olmaq keçirmi?**

– Qətiyyən! Nə danışırsınız?! Başıma hava gəlib, nədir?! Adam infarkt olub ordaca ölüb qalar. Mən orada davam gətirə bilmərəm. O boyda da lağlağı olar? O qədər də adam heç nə üstündə mübahisə edər...

**–...**

**–...**

**– Deyəsən, sizi yorduq? Müsahibə üçün təşəkkürlərimizi qəbul edin.**

**Şəkilinizi də versəniz pis olmazdı...**

– Nə danışırsan, nə yorulmaq?! Tez-tez gəlin. Mən də sizə təşəkkür eirəm ki, mənə baş çəkdiniz. Bəs, şəkilimi neyləyəcəksiniz?!

...Manaf Süleymanov gülüşlə, zarafatla bizi qarşıladığı kimi, gülüşlə, zarafatla da yola saldı.

# GÜNORTAYADƏK... ÜÇ SAAT MANAF SÜLEYMANOVLA
## III hissə

"Ağlayana süd vermirlər mənsə ağlayan deyiləm"

*...Söhbətimiz uzanır.*

*Ciddi söhbətləri adamı düşündürməyə məcbur edir.*

*Onu danışdırmaq, danışdırmaq istəyirsən. Çünki...*

*Onun yalnız Manaf Süleymanova məxsus deyim tərzi var.*

*Yalnız Manaf Süleymanov olub-keçənlərdən belə xronoloji ardıcıllıqla danışa bilər.*

*Yalnız Manaf Süleymanov həyat reallıqlarını real faktlarla sübut edə bilər. Bilirsən ki, kim-kimdir, kim hansı yuvanın quşudur.*

*Yalnız...*

"Eşitdiklərim, Oxuduqlarım, Gördüklərim"in capdan çıxması böyük səs küyə səbəb oldu. Necə oldu ki, eşitdiklərinizi, oxuduqlarınızı, gördüklərinizi açıq-saçıqlığı ilə ortaya çıxara bildiniz?

Bu əsər olan tariximizin əksi idi. Bu əsər mütləq yazılmalı idi. İnanırdım ki, o vaxt bu əsəri ortaya çıxarmaq, vaxtında deyilmiş söz kimi təsirli olmalıdır. Bilirdim ki, bu əsəri Yazıçılar İttifaqına təqdim etsəm atacaqlar ora-bura. Unudulacaq, yaddan çıxacaq. Eləməyib tənbəllik, yazdıqlarımı qoltuğuma vurub, getdim birbaşa Həsən Həsənovun yanına. 1982-ci ildə belə bir əsərlə Mərkəzi Komitəyə getmək cürət tələb

edirdi. Həsən Həsənov ideologiya üzrə katib idi. Kitablarımın üz qabıqlarnın fotoşəkilini aparmışdım. Məni qəbul edəndə dedi: "Yəni sənin bu qədər kitabın var? Bəs mən səni niyə tanımıram?"

Dedim: "Sənin məni tanımamağın mənim günahım deyil ki!". Əsəri oxudu, o saatda zəng edib Yazıçılar İttifaqında kiməsə göstəriş verdi ki, əsəri dərc etsinlər. Səhərisi gün Yazıçılar İttifaqında oldum. Yaman əl-ayağa düşmüşdülər. Bir vur çatlasın vardı ki! Soruşdular: "A kişi, sən haradasan, hanı sənin kitabın, haçan vermisən?" Dedim ki, verməmişəm e, budur təzəcə gətirmişəm. Sakitləşdilər, toxdadılar. Haçandan-haçana özlərinə gəlib: "Biz də dünəndən bəri axtarırıq ki, haraya qoymuşuq sənin yazılarını" – dedilər. Əsəri alıb oxudular. Əkrəm Əylisli, Nemət Veysəlliyə tapşırdı ki, əsər üzərində işləsin. Ay işlədilər, ha?! Bir hay həşir qopardılar!!! Dedilər ki, əsəri bu şəkildə çap etmək olmaz. Ora-burasını ixtisar edib yaman günə saldılar və 15 cap vərəqi həcmində olan əsərin üçdə birini 1984-cü il "Azəbaycan" jurnalında çap etdilər.

**– Əsəri kitab halında çap etdirməyə nail ola bildinizmi**?

– Nə danışırsan? Jurnalda əsəri oxuyanlar məni dəniz qırağına çağırdılar. "Bu nədir?" – deyə qışqır-bağır salmağa başladılar. Hacı Zeynalabdin kimi "xalqın qa-

nını içən kapitalisti" tərifədiyim üçün məni qınadılar.

Bilirdim ki, ağlamayana süd vermirlər. Məndə ağlaya bilmirəm kiminsə qarşısında. Hətta, öz tələbəm olmuş dövlət katibi Mədhət Abbasovun yanına getməyi belə şənimə sığışdırmırdım.

Onu deyim ki, "qlavlit"in yanına özümü göndərdilər. "Qalvanit"in rəhbəri Cahangir İldırımzadə idi. Əsər, onun xoşuna gəlmişdi. Çapına razılıq üçünsə heç kəs qol çəkmək istəmirdi. Cahangirin özü axırda razılıq verdi.

Heç bilirsən Yazıçılar İttifaqının özündə belə kitabın əleyhinə gedən nə qədər adam var?! Yaxşı ki, bizim Anar kimi, həqiqəti bilib dərk edən yazıçılarımız varmış.

Kitabımın birinci hissəsini – Mədət Hafizin həyatını, – "Qobustan"da çap etdirmək istəyirdim.

Getmişdim redaksiyaya bu istəklə. Anar əlyazmalarımı alıb dedi ki, bir-iki gündən sonra gəlim. Getdim, əsəri oxumuşdu. Mənə dedi. Manaf müəllim, əvvəlki 8-9 səhifəni də axırıncı 5-6 səhifəni də hamı, hətta mən də yaza bilərdim. Amma ortadakı 80 səhifə var ha, onu səndən başqa Azərbaycanda heç kəs yaza bilməz. Hamı bir yerə yığılsa da yaza bilməzlər. Get kitabı tamamla.

**– Əsərlərinizdə VAXTI, ZAMANI iri hərflərlə qeyd etmək olarmı?**

– Kitab çətinliklə ortaya çıxır. Uzun illər arxivdə işləməyi bacaran, gərək vaxtında yazdığını xalqa çatdırmağı da bacara. Yoxsa yazılanın dadı da, duzu da, ləzzəti də vaxtı keçəndən sonra, o effekti vermir.

O, kitabı o vaxt çap elətdirmək böyük cəsarət idi. Bu gün cap edilsəydi, bəlkədə daldan atılan daş təsiri bağışlayardı. Məncə, adını çəkdiyiniz həmin o səs-küylü əsərimdə mən VAXT, ZAMAN obrazını qeyd edə bilmişəm. Cünki deyilənlər məqamında deyilib.

**– Manaf müəllim, necə düşünürsüz, yaradıcılığı boyu xalqın yazıçısı, şairi ədalət prinsipinə əməl edə bilirmi? Vaxt, zaman anlayışı ilə ədalət bir araya sığırmı?**

– Xalqın yazıçısı, şairi olmaq ağır yükdür. Bu yükün altına girməyi bacaranlar ədalətli ola bilər. Yalmanmağı, yaltaqlanmağı bacarmayanlar ədalətli ola bilər. Gərək gözu, könlu tox olasan ki, səni ədalətli sənətkar kimi tanıyalar. Kiminsə xoşuna gəlmək, kiminsə ürəyini oxşamaq istəyi ilə yazdınmı, dünya yığılsa da, ədalətli sənətkar kimi tanına bilməzsən. Xalqın gözü tərəzidir.

Əşşi, bir ömürdür də...

Çalış kişi kimi yaşa, yarat. Öləndə də arxanca danışmasınlar, eninə-uzununa döşəməsinlər.

Yoxsa bu nədir, hamımızın tanıdığımız bir xalq şairimiz var. Hansı prezidentin şərəfinə poema yazmayıb. Bu günkünün də şərəfinə "bir poema" çap elətdi-

rib. Vallah düz deyirəm. Qəzetləri oxusaydınız bilərdiz o kimdir.

**– Könül evinizi yıxan sənətkarlar... Onlar haqqında nə deyə bilərsiz?**

– Mən bir neçə xalq şairi, xalq yazıçısı barədə deyə bilərəm ki, onlar bu adı doğrultmurlar. Bu adlar əslində şərəfliləri yüksəltmək üçün verilməlidir. İndi şair, yazıçımı var? Hərə öz işində öz aləmində. Mənim bir neçəsindən ancaq xoşum gəlir. Amma onların başında Sabir dayanır. Bax o əsl xalq şairidir. Bu günün reallığı ilə ayaqlaşır. Sənət nöqteyi nəzərincə iki böyük şairin romantikliyinə, fəlsəfi zənginliyinə görə "könül evinə" daha yaxın hesab edirəm: Məhəmməd Hadini və Hüseyin Cavidi və birdə Məmməd Arazı. Onun da şeirlərindən yoxdur ha! Manaf Süleymanovun konül evinə yaxın olmaq üçün bax bu səpkidə yazmaq lazımdır.

**– Sizə elə gəlmir ki, bu gün Azərbaycan nəsrində, Azərbaycan şeirində təfəkkür və düşüncəyə o qədər də yer verilmir...**

– Mən dedim axı! İndi sənət yoxdur. Sənəti yaşatmaq istəyənlərin indi gözünü pul qazanmaq ehtirasları qapayıb. Sənət də, sənətkar da böhran məngənəsində çabalayır. Onu dirçəltməyə oğul, onları birləşdirən qurum lazımdır.

Bilin ki, ədəbiyyatımızın növ və janr zənginliyinə görə dünyada tayı bərabəri yoxdur. Bir dəfə xarici qonaqları müşaiyət etməyi tapşırmışdılar. Ədəbiyyatdan,

sənətdən söz düşdü. Dedim ki, bizim ədəbiyyatda elə janr var ki, heç bir xalqın ədəbiyyatında o yoxdur. İnanmadılar dodaq büzdülər. Bir dodaqdəyməz dedim. Dedim ki, dodaqdəyməz elə olmalıdır ki, sözdə dodaq hərfləri olmasın. Çalışdılar, dodaqlarını oyan-bu yana nə qədər büzsələr də belə şeir deyə bilmədilər. Etiraf etdilər ki, bu xalqın ədəbiyyatı zəngin aləmdir. Onun taleyi, qədir bilənin əlində deyil ona görə pis günə düşüb.

**– İstiqlaliyyət dövründə sənətkarlarımızın vəziyyəti çox pisləşib. Çünki onların məsuliyyəti də artıb. Onlara sözünüz varmı?**

– Nə sözüm olacaq ki? Onsuz da sənətkarların məsuliyyəti xalq qarşısında həmişə böyük olmalıdır. Vəzifə hara şair hara, yazıçı hara?! Onsuz da xalqın sənətkara vəzifədə olmasa da ehtiyacı var.

Məni də çox çəkiblər ayrı-ayrı dəstələrə. Getmədim. Axı mənim nə işim var?! Mən yazı, qələm adamıyam.

Hər gün sənətkar həqiqəti deməlidir. Mən həqiqəti həmişə demişəm. Məni oldürməyiblər ki?!

**– Şairlərimizdən, yazıçılarımızdan sizə baş Çəkənləri olurmu? Bu adamlar nə iş görüblər sizinçün?**

– Mənim əvəzimə onlar nəsə işmi görməlidilər ki?! Yox, mən ünsiyyət saxlamağı bacarmıram. Amma sizin kimi dostlar tez-tez gəlirlər. Təvazükarlıqdan uzaq olsa da yaxşı bilməlidirlər ki, mən bu xalqın bir əsirlik tarixinin canlı arxiviyəm.

Bacılarım, qızım da tez-tez gəlirlər. Şairlərin, yazıçıların nə işi var mənim yanımda?! Mən ədəbiyyatdan

danışıram, onlar mal dövlətdən, puldan. Bu gün ortada sənət yoxdur. Canım, şairin, yazıçının ancaq adı qalıb.

**– Ədəbiyyatımızdakı tənəzzül sözsüz sizi də düşündürür. Necə olur ki, ədəbiyyat reallığı tam varlığı ilə əks etdirə bilmir?**

– Qəlbində ədəbiyyata yanğı olan hər kəsi düşündürməlidir bu sual. Mən təəssüf edirəm ki, yaşlı nəsildən olan həmkarlarım da bu cür suallara aydın cavab verməkdən çəkinirlər. Dövlət qayğısı olsa, yazıçı da, şair də gözəl əsərlər yazar. İndinin özündə də həyatımızı tam oxşarlığı ilə əks etdirən əsərlər yazılır. De görüm qələm sahibi bu əsəri necə çap etdirməlidir? Kitabı çap etdirmək heç bilirsənmi neçəyə başa gəlir?

Bir də sənətkar çalışmalıdır ki, hansısa rəsmi quruma qulluq etməsin yaltaqlanmasın. Xalqa qulluq etmək! Vəssalam!

**– Adətən yazıçılara belə bir sualla müraciət edirlər. İndi hansı əsər üzərində işləyirsiz?**

– Bu soyuqda işləməkmi olar? Evdə oturmaq olmur. İşıq yox, qaz yox. Deyən yox ki, bir baxaq görək Manaf müəllim nə işlə məşğuldur, necə yaşayır?... Musa Nağıyevin, Hacı Zeynalbdinin fəaliyyətinə həsr olunmuş kitabları çap etdirəcəyəm. Doğma Lahıc haqqında yazıram. Ata yurduma gedirəm tez-tez. Lahıc üçün burnumun ucu göynəyir. Sən də qocalanda belə olacaqsan.

**– Bir sualım da şablon olacaq. Gənclərə nə sözünüz?**

– İşlə məşğul olsunlar. Ağsaqqal sözünə qulaq assınlar. Məsləhətli don gen olar. Özbaşnalıq adamı Əlidən də edər, Vəlidən də. Boş vaxtlarınızda dil öyrənin. İndi dövr bunu tələb edir. Dillə Azərbaycanı dunyada tanıtmaq olar. Gənclər gələcəyimizdirsə, gələcəyimiz üçün də çalışmalıdırlar.

*“Millət” qəzeti,*
*22.12.1993*

## GÖYÇƏNİN ÖZÜ BÖYÜK BİR AKADEMİYA İDİ

*(goyce.az saytına müsahibə)*

Rüstəm Dastanoğlu ədəbiyyatın içini çölündən aydınca görən geniş eridusiyalı fikir adamlarındandır. Orta məktəb illərindən yaradıcılığa başlasa da, ötən əsrin 80-ci illərinin sonlarında mərkəzi mətbuatda hekayələri çap olunub.

Çap olunan əsərləri haqqında tanınmış şair və yazıçılar yüksək fikir bildirsələr də, məlum Qarabağ hadisələrindən sonra ədəbiyyatda yaranmış boşluq onu ədəbi mühitdən uzaq salır. Karyerasını biznes sahəsində inkişaf etdirsə də, yazıçılıq missiyasını isə öz hücrəsinə çəkilib səssiz şəkildə davam etdirir.

Hər görüşümüzdə Göyçə və ədəbiyyat mövzusu söhbətimizin baş qəhrəmanına çevrilir. Dünyada, cəmiyyətdə gedən ictimai, siyasi və ədəbi prosesi realizə etmək qabilyyətinə malik bir düşüncə adamı kimi Rüstəm Dastanoğlu ilə həmsöhbət olmaq həm də könül rahatlığıdır.

Görüşlərimizin birində söhbətimizi diqtafonun yaddaşına yazıb, goyce.az-ın oxucuları ilə bölüşməyi özümə borc bildim.

**– Rüstəm müəllim, kifayət qədər yaşınız, həyat təcürbəniz, dünya görüşünüz, mütaliəniz var. Bu ömrün arxasından geriyə boylananda Göyçə necə görünür?**

– Hər bir insanın harada anadan olması özündən asılı olan bir şey deyil. Bizim də bəxtimizə Göyçə mahalında doğulmaq düşüb. Böyük Qırğız yazıçısı Çingiz Aymatovun məhşur bir sözü var: Uşaqlığını harada itiribsənsə, ora sənin vətənindi. Mənim də uşaqlığım, yeniyetməlik illərim Göyçə mahalında keçib. 1988-ci ilə qədər harada olmağımdan asılı olmayaraq həmişə gedib-gəlirdim. Çünki o torpaq həmişə bizi özünə çəkirdi. Göyçənin özünəməxsus iqlimi, təbiəti, relyefi, adət-ənənəsi, ağırtaxtalı ağsaqqaları, ağbirçəkləri, igidləri, sənətkarları var idi ki, onlar ancaq o torpağa uyğun mühitdə yetişmişdilər. Bizim kəndimiz də dəniz səviyyəsindən təqribən 2200 metr yüksəklidə yerləşən qədim bir dağ kəndi idi. Yazda-yayda gül-çiçəyə bürünüb romantik duyğuları oyadan, hər tərəfi göz işlədikcə uzanan göyçəmənliklərlə əhatə olunmuş bu dünyadakı cənnətin özüydü desəm, yəqin ki səhf eləmərəm.

**– Göyçə təkcə təbiət gözəlliklərinə, o ünlü sənətkarları yetirdiyinəmi görə dəyərliydi? Yoxsa ayrıca bir sehri, qudsallığı varıydı?**

– Biz Göyçədə olmasaq da, Göyçə indi də öz yerindədi. Amma indiki Göyçə biz dediyimiz Göyçə deyil. Çünki Göyçəni göyçəkləşdirən tək Tanrı deyildi, həm

də bizlər idik. Onun daşının, qayasının, torpağının dilini bilən bizlər... Göyçə bizlərlə, öz əzəli sakinləri ilə gözəliydi. Göyçənin bünövrəsi sağlam sütunlar üstündə qurulduğundan mühit də sağlam idi. Ona görə də o mühitdən çıxan adamlar da sağlam düşüncəyə, əxlaqa malik olurdu. Orada hər şeydən əvvəl hər bir insanın öz adını qorumaq missiyası varıydı. Sözə hörmət varıydı. Çox az sayda insanlar tapmaq olardı ki, sözünə, vədinə əməl etməyənlərdən olsun. Ona görə də biz uşaqlıqdan bilirdik ki, böyüklə necə davranmaq lazımdı, kiçiklə necə davranmaq lazımdı. Sözü necə danışmaq lazımdı. Kitablarda deyildiyi kimi kainatı da Allah sözdən bərqərar edib. Bir sözlə, söz ən ali dəyər idi göyçəlilər üçün. Aşıq Ələsgəri də o sözün aliliyini dərk edən mühit yetirmişdi.

**– İndi bəziləri deyirlər Aşıq Ələsgərin savadı olmayıb. Sizcə, doğurdanmı Aşıq Ələsgər savadsız idi?**

– Aşıq Ələsgər mədrəsə-məktəb təhsili almasa da, yazı pozu bilməsə də, elm ona Allah tərəfindən buta şəkilində verilmişdi. Belə olmasaydı o elmi heç vaxt oxumaqla qazanmaq olmazdı. Düzdür, Ələsgərin ustadı kimi Aşıq Alının da böyük xidmətləri var. Aşıq Alı da böyük fikir adamı, böyük sənətkar idi. Bütün bunlarla bahəm, el-obanın tələbkarlığı insanların özündə danışdığı informasiya bir başa Aşıq Ələsgərin düşüncə tər-

zinə, yaradıcılığına siraət etmişdi. Eyni zamanda Aşıq Ələsgərin möhkəm hafizəsi, qulaq-göz yaddaşı, özünə tələbkarlığı onu ən yüksək səviyyədə formalaşdırdı. Aşıq sənətinin, xalq şeirinin ən möhkəm sütununa çevirdi. Onun haqqında eşidib-bildiklərimiz bir daha təsdiqləyir ki, Aşıq Ələsgər seçilmişlərdən idi. Bu, danılmaz bir reallıqdır. Ələsgərin dövründə tək Göyçədə yüzdən artıq aşıq, şair varıydı. Amma hamısı onun kölgəsində qaldı. Heç biri Ələsgərin ucaldığı mərtəbəyə qalxa, toxunduğu mətləblərə toxuna bilmədi. Ona görə Göyçədə hər adam aşıq ola bilməzdi, şeir yazıb özünü şair kimi təsdiq edə bilməzdi. Bu mənada bütün olanları ilə Göyçənin özü böyük bir akademiya idi. Aşıq Ələsgər də o akademiyanın ən parlaq məzunu oldu.

Qaldı Ələsgərin savadına. Aşıq Ələsgər demək olar bütün şeirlərində hansı bilgiyə sahib olduğunu ən yüksək səviyyədə nümayiş etdirib. Bir misrasında isə özünün savadı, müəllimi haqqında bütün gizli kodları açıb. “Şahimərdan nökəriyəm, dərsimi pünhan verir”.

**– 1988-ci il hadisələrini, göyçəlilərin qaçqınlığını necə xatırlayırsız?**

– Mən onda Ukraynada idim. Eşitdim ki, Göyçədə köç başlayıb gəldim Azərbaycana. Bizim ailəmiz tək canlarını götürüb çıxmışdılar, heç nə gətirə bilməmişdilər. Allah ömür versin, onda Zakir Kərimov Gədəbəyin polis rəisi işləyirdi. O, bizə maşın verdi, əmioğ-

lanları ilə getdik köçümüzü gətirməyə. Dekabrın 7-də biz çatdıq kəndə, kənddə 4-5 adam qalmışdı. Rəhmətlik Yaqub, Müslüm dayı, Şamoyev Bayram kənddə idi. Kəndə getdik ki, rus əsgərləri post qurub, girişə, çıxışa nəzarət edir. O əsgərlərin nəzarətində kəndi görəndə elə bildim kəndimiz ölüb, biz də onun yasına gəlmişik. Necə bir adam ölə, ruhu bədəndən çıxa, quruca cismi qala ha, bax eləydi kəndimiz. Təbiətin harmoniyası itmişdi, elə bil dağlar da əzəmətini itirmişdi. Başqa vaxt başının üstündə ulduzları sayrışan kənd, bir həftənin içində xarabazara çevrilmişdi. Ən çox həmin vaxt diqqətimi çəkən həyətimizdəki toyuq-cücənin bizdən gizlənməyi idi. Başqa vaxt həyətə girəndə toyuq-cücənin səsi aləmi başına alardı. Amma həmin gün toyuqlar da bizdən qaçırdı, tövlənin ən qaranlıq küncünə, bucağına sakitcə gizlənmişdilər. Elə bil nəfəs də almırdılar. Sanki ayrılığı duymuşdular, evdən ayrılmaq istəmirdilər. Ölüb Göyçədə qalmaq istəyirdilər. Dəhşətli bir səhnə idi…

**– Nə yaxşı ermənilər həmin vaxt sizə dəyib-dolaşmadılar?**

– Biz kənddən dekabrın 8-də çıxdıq, bir gün əvvəl Ermənistanda – Spitakda güclü zəlzələ olmuşdu deyə başları özlərinə qarışmışdı. Yoxsa çox riskli bir addımıydı onda Göyçəyə getmək. Hər cür təhlükəynən qarşılaşa bilərdik. Biz kənddən çıxanda arxamızca ermə-

nilərin silahı olan güllə, daşa gücü çatan da daş atırdı.

**– Aradan 30 il vaxt keçib, bir anlıq təsəvvür edək ki, Göyçə dağılmayıb, hamı öz ocağındadı. İndiki Göyçəni necə təsəvvür edirsiniz? İqtisadi inkişaf, mənəvi azadlıq, tərəqqi olacaqdımı?**

– İnsan istər-istəməz zəmanəyə uyğunlaşır. SSRİ-nin dağılması, zamanın gətirdiyi yeniliklər, yaranacaq siyasi sabitlik göyçəlilərə xüsusi bir stimul verəcəkdi. Hələ sovet vaxtı, xüsusən 80-ci illərdən sonra insanlar özünə orada yaxşı gün-güzaran qurmağa başlamışdı. Hamı yavaş-yavaş varlanır, evlər tikir, maşın alırdı. O ki, qala indi. Göyçə camaatı indi orada yaşasaydı, camaatın maddi, sosial problemləri demək olar ki, olmayacaqdı. Göyçənin çox münbit torpağı var. Bizim Daşkənd kəndi Göyçədə ən böyük torpaq sahəsi olan kəndlərdən idi. Torpaqlar kəndlilərə paylansaydı, tək kartofçuluqla rahat yaşamaq mümkün idi. Yadımdadı, biz həyətdə 7-8 sot yerdən 2 tondan artıq kartof yığırdıq. Heyvandarlıq üçün çox əlverişli şərait varıydı. Geniş otlaqlar varıydı ki, yüzlərlə mal-heyvan saxlayıb imkanlı fermer olmaq olardı. Hər şeydən əvvəl kəndimizin varlığı, onun sakinləri üçün bir təkanverici qüvvənin olması bütün uğurların əsas mənbəyinə çevriləcəkdi. Onun qoynunda yaşayan insanların bir araya gəlməsi, mənəvi bağların qırılmaması, elin-obanın bütövlüyü iqtisadi, elmi, mədəni, mənəvi inkişaf yaxşı

mənada bir rəqabət yaranacaqdı. Təhsil alanların, elm adamlarının, sənətkarların, imkanlı şəxslərin sayı çoxalacaqdı. O imkanlı şəxslər iş yerləri açacaqdı. Ən əsası da bizim orada sayımız çoxalacaqdı, çoxaldıqca bütün sahədə imkanlar artacaqdı.

**– Aprel döyüşlərindən sonra cəmiyyətdə bir oyanma var; Prezident İlham Əliyev də çıxışlarında tez-tez İrəvana qayıdacağımızı vurğulayır. İnsanlar o torpağa qayıtmaq üçün müəyyən təşkilatlar yaratmağa, beynəlxalq aləmə müraciət etməyə cəhd edir. Siz necə düşünürsünüz, biz İrəvana, Zəngəzura, Göyçə mahalına qayıdacağıq?**

– Tarix təkrar olunur. Qərbi Azərbaycanda bütün mahallarla birgə Göyçə mahalı təkcə XX əsrdə 4 dəfə qaçqın düşüb, amma yenə də qayıdıb. Ən uzun sürən ayrılıq 1988-ci ildə oldu. Artıq 30 il keçir. Heç vaxt ora qayıtmaq ümidim ölməyib, həmişə də inanmışam ki, mütləq biz ora qayıdacağıq. Çünki ermənilər bu 30 ildə istər fiziki, istərsə də mənəvi olaraq o torpağa sahib çıxa bilmədilər. Kəndimizdən olan çəkilişlərə baxıram ki, 10-15 evdə yaşayış var, o da qoca-qoltuq ermənilərdi. Birincisi, say baxımından onlar orada çox azdı. Az olduqlarından o yerlər boşuna qalıb. İkincisi də onlar o torpağın dilini bilmirlər. Bilsələr, əkib-becərərlər. Torpaq da öz sahibini tanıyır, o da canlıdır, onu kim sevir, kim sevmir hiss edir. Ermənilər özləri də dərk edirlər

ki, onlar orada müvəqqəti qonaqdırlar. Qayıdış bir gün olacaq, özü də bizim düşündüyümüzdən də sürətli. Kənardan nə qədər çətin görünsə də, o günə çox az qalıb.

**– Sizi yaxından tanıdığımdan, çoxsaylı söhbətlərimizdən bilirəm ki, Türk-Turan dünyasının qurulmasında atılan hər bir addımı xüsusi bir fəallıqla, həyəcanla izləyirsiniz. Son illər türkdilli xalqlar tərəfindən bir yaxınlıq sezilməkdədir. Prosesi dərindən izləyən bir türkçü kimi Turan dünyasının qurulmasında türkün birliyi hazırda nə yerdədir?**

– Bu günün reallığında dünyada qütbləşmə gedir, bunu hamı bilir. Dünyada güc sahibi olan dövlətlər var ki, onların güclü hərbi qüvvələri, güclü silahları, atomu var, bir də böyük ümumudaxili məhsulu olan dövlətlər var. Amma dünyada iki dövlət var ki, onların daha çox daxili enerjisi var. Daxili enerji xalqdan, millətdən gələn enerjidi. O iki dövlət: Türkiyə və Çin dövlətidi. Vaxtilə İngiltərə o daxili enerjinin gücü sayəsində dünyanın yarısını zəbt edib. Hazırda Türkiyədə daxili enerjisi çox güclüdü. Açıq etiraf edək ki, Ərdoğan hakimiyyətdə olduğu vaxtda bu hiss daha da gücləndi, yatmışları oyatdı. Bütün dünyaya türkün kimliyini hər çıxışında xatırladır. Suriya məsələsidə qəti mövqe ortaya qoydu. Türkiyə dövlət olaraq dünyada xüsusən şərqdə gedən ictimai-siaysi məsələlərdə yaxından iştirak edir. Hazırda Qüds məsələsində addımlar atır. Mən ümid edirəm

ki, yaxın 10 ildə Türkiyə dünyanın 5 super gücündən biri olacaq. Bu da Türk müsəlman dünyasının ən böyük qələbəsi deməkdir. Hazırda türkdilli dövlətlər arasında bir istiləşmə hiss olunur. Artıq Özbəkistan da Türkiyə ilə yaxınlıq edir. Bu yaxınlığın sayı, coğrafiyası getdikcə genişlənəcək inşallah.

***goyce.az** saytı, 2019.*
*Müsahibəni götürdü:*
***Qılman İman,***
***İlqar İsmayıl***

## FREYD MƏNİM ÜÇÜN AVTORİTET DEYİL

*Adı Rüstəmdir, özü də Dastanoğlu. Adamın 65 min tirajla hekayəsi cıxıb. İndi iş adamıdır. Vəhşi İstedadı var və onu gizlədir. Pulu bircə şeyə görə qazanır – ətrafına dayaq olsun. Maliyyə baxımından hər şeyə nail olub, ədəbiyyatda heç nəyə. Görkəmi çox yaxşıdır. Açığı, o yaşı verməzdim. Hekayələri çox yaxşıdır. Özünəməxsus fərqlilik var. İş adamı kimi isə çox ədalətlidir. Bir qadın kimi mənə maraqlı olan bütün suallarımı ona verdim...*

**– Niyə Datanoğlu?**

– Atamın adı Dastandır, ona görə də Dastanoğlu.

**– Hansı dastanı çox sevirsiniz?**

– Uşaqlıqdan nənəm Şah Abbasla, Aşıq Ələsgərlə, Aşıq Ələsgərin qardaşı Məhəmmədlə, Aşıq Alının Türkiyə səfəri ilə bağlı dastanlar danışırdı. Hansı ki, onlar yazılı ədəbiyyatda yoxdur. Dastanları kitabdan yox, nənəmin danışdığı formada daha çox sevərdim.

**– Kimdir Rüstəm, iş adamı yoxsa yazıçı?**

– Təbiətən yazıçıyam və həmişə özüm üçün yazmışam. Əməldə isə daha çox yaradıcı iş adamıyam.

**– Bəs, mahiyyət etibarı ilə?**

– Daha çox yaradıcı.

**– Nəyi yaratdınız?**

– Əlbəttə, ən böyük yaratdıqlarımız balalarımızdı.

**– Neçə balanız var?**

– 4 balam var.

**– Hansı daha gözəldir?**

– Hamısı gözəldir.

**– Hansının adına dastan qoşardınız və ya atanızın adını kimə qoymusunuz?**

**–** Hələ ki heç birinə.

**– Neçə yaşınız var?**

– 55 olacaq.

**– 55 yaşında yenə də övlad istəyirsiniz?**

– Qismətdi. Hər şey ola bilər.

**– Övladlarınızın adlarını bilmək olar?**

– Tural, Günel, Nürgün, Aynur.

**– Hmm, türkçülüyə meyliniz var?**

– Əlbəttə. Mənim atamın ta o vaxtlar pasportunda milliyəti türk yazılmışdı. Göyçədə ermənilər bizə həmişə türk deyərdi. Şübhəsiz biz türkük.

**– Yaxşı, gəlin şübhədən danışaq. Nədən şübhəlisiniz? İş adamı olmaqdan, yoxsa yazıçı olmaqdan?**

– Elə bir şübhəli fikirim yoxdur. Yazıçılığa başlamağım 24-25 yaşında hekayə yazmaqla olub. Hekayəmi apardım yazıçılar birliyinə. Gənc vaxtlarım idi. Yazıçılar birliyi mənim üçün əlçatmaz idi. Zamanla gördüm ki, fikirləşdiyim kimi deyilmiş.

**– Rüstəm bəy, siz nəyə görə yazırsınız?**

– Bu bir tələbatdır. Yazımı bitirəndə özümü çox güclü hiss edirəm. Ruhum azad olur.

**– Xoşbəxtsiz?**

– Mən xoşbəxt adamam.

**– Freyd deyir, ancaq dəlilər xoşbəxt olur...**

– Freyd, ümumiyyətlə, xəstə adam olub. O, mənim üçün bir avtoritet deyil. Avropanın, Amerikanın bəlaları Freyddən gəlir. Elə çox bilirdisə, özünü xoşbəxt edərdi. O cür sonluğu olmazdı.

**– Bu yaşda bir qadın sizdən nə soruşa bilər?**

– Nə istəsə...

**– O zaman qocalmısınız?**

– Yox. Daxilən özümü 20 yaşında gənc kimi hiss edirəm. Qoca hiss etmək istəsəm belə, alınmır.

**– Tarkovski niyə bu qədər maraqlıdır sizə?**

– Ona görə maraqlıdır ki, onun çəkdikləriylə, yaşantısıyla özümdə bir uyğunluq görürəm.

**– Azərbaycan ədəbiyyatında kimi böyük sayırsınız?**

– Füzulini, Aşıq Ələsgəri, Şəhriyarı, Ramiz Rövşəni.

**– Hekayələrinizi oxumuşam qəşəng yazırsınız.**

– Çox sağ olun.

**– Riyakarsınız?**

– Yox.

**– Səmimisiniz?**

– Baxır kiminlə.

**– Sonda... Yaxşı kişisən, yoxsa pis kişisən?**

– Çalışmışam ki, Vətənim, ailəm, doğmalarım, yaxınlarım üçün yaxşı kişi olum.

*Müsahibəni götürdü:*
*azvision.az saytı, 2015*

# KİTABIN İÇİNDƏKİLƏR

## Publisistika



## Səfərlər



## Söhbətlər və müsahibələr